İndekslər və məlumat bazaları

Indexes & Databases























































// AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
Elmi-metodik jurnal. 1954-cü ildən nəşr olunur.
ISSN 2790–0738 (Print) | ISSN 2791–0911 (Online) | ISSN-L 2790–0738

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1997-ci il tarixli əmri ilə Nizamnaməsi təsdiq edilmiş, Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyində dövlət qeydiyyatına alınmışdır. Seriya AB № 022436 | Qeydiyyat № B236

"Azərbaycan dili və ədəbiyyat tədrisi" dilçilik və ədəbiyyatşünaslıq sahələrində Azərbaycan, türk, ingilis və rus dillərində elmi məqalələr dərc edən, dilimizin saflığı və işləkliyini qoruyan, Azərbaycan dili və ədəbiyyatının tədqiqi və təbliği məsələlərini araşdıran, tədris metodikasını və müasir tədris yanaşmalarını əhatə edən, bu sahələrdəki yenilikləri işıqlandıran, müqayisəli və beynəlxalq təhlillərə əsaslanan tədqiqatları qəbul edən resenziyalı, açıq girişli elmi-metodik nəşrdir. Jurnal il ərzində dörd dəfə Creative Commons Attribution-NonCommercial 4.0 (CC BY-NC 4.0) lisenziyasının şərtləri əsasında onlayn yayımlanır və çap edilir. Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının tövsiyə etdiyi dövri elmi nəşrlər sırasına daxildir.

---

**TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE**
Scientific-methodical journal. Published since 1954.
ISSN 2790–0738 (Print) | ISSN 2791–0911 (Online) | ISSN-L 2790–0738

The Charter of the Ministry of Education of the Republic of Azerbaijan was approved by the order dated May 5, 1997, registered with the Ministry of Press and Information of the Republic of Azerbaijan. Series AB No. 022436 | Registration No. B236

"Teaching of Azerbaijani Language and Literature" is a peer-reviewed, open-access scientific and methodological journal that publishes scientific articles in the fields of linguistics and literary studies in Azerbaijani, Turkish, English and Russian, protects the purity and functionality of our language, investigates issues of research and promotion of the Azerbaijani language and literature, covers teaching methodology and modern teaching approaches, highlights innovations in these fields, and accepts research based on comparative and international analyses. The journal is online published and printed four times a year under the terms of the Creative Commons Attribution-NonCommercial 4.0 (CC BY-NC 4.0) license. It is included in the list of periodical scientific publications recommended by the Higher Attestation Commission under the President of the Republic of Azerbaijan.

# İÇİNDƏKİLƏR

## Cild 71  Say 2 / 2025

# CONTENTS

## Volume 71  Issue 2 / 2025

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 12–21
https://doi.org/10.48445/e7079-0995-1660-h

# Şərqi slavyan dillərində Azərbaycan türkcəsindən keçmiş sözlər

***Minaxanım Nuriyeva Təkləli*** [1]

**XÜLASƏ**

*Türk dillərinin mədəni, inzibati, hərbi, gündəlik və dövlətçilik sahələri ilə bağlı zəngin leksikası Şərqi slavyan dillərində, xüsusən də rus dilindəki türk elementlərinin zənginləşməsi üçün mühüm bir mənbə olmuşdur. Nəticədə, türk dillərindən alınan sözlərin böyük əksəriyyəti rus dilində əsas mövqe qazanmış və zəruri leksik vahidlərə çevrilmişdir. Həmin sözlər silsiləsinə digər Qafqaz xalqlarından keçmə sözləri əlavə etməklə bu mənzərəni daha da zənginləşdirə bilərik. Tədqiqat prosesində yaradıcılıq yolları Qafqazdan, o cümlədən Azərbaycandan keçən və fəaliyyətləri Qafqaz ölkələri ilə sıx bağlı olan Puşkin, Qriboyedov, Lermontov, Polejayev, Polonski, Bestujev-Marlinski, Lev Tolstoy kimi yazıçıların əsərlərinin dili üzrə apardığımız müşahidələr uğurlu nəticələr vermişdir. Onların xüsusən Qafqaz mövzulu əsərlərində aşkar etdiyimiz Azərbaycan türkcəsinə məxsus yerli sözlər Qafqaz xalqlarının həyatını, məişətini, insanlarını bütün xarakterik xüsusiyyətləri ilə əks etdirir.*

**AÇAR SÖZLƏR**

*Qafqaz, Azərbaycan türkcəsi, türk dilləri, dil mübadiləsi*

**MƏQALƏ TARİXÇƏSİ**

Göndərilib: 12.03.2025
Qəbul edilib: 05.05.2025

[1] Filologiya elmləri doktoru, professor, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. https://orcid.org/0000-0002-4985-8134 | proftomris@gmail.com

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 12–21
https://doi.org/10.48445/e7079-0995-1660-h

# Words from Azerbaijani Turkish in Eastern Slavic Languages

***Minakhanim Nuriyeva Taklali*** [1]

**ABSTRACT**
*The rich lexicon of the Turkic languages related to cultural, administrative, military, everyday and state spheres has been an important source for the enrichment of Turkic elements in the East Slavic languages, especially in the Russian language. As a result, the vast majority of words borrowed from the Turkic languages have gained a fundamental position in the Russian language and have become necessary lexical units. We can further enrich and make this picture sustainable by adding words from other Caucasian peoples to this series of words. During the research process, our observations on the language of the works of writers such as Pushkin, Griboyedov, Lermontov, Polezhayev, Polonsky, Bestuzhev-Marlinsky, Lev Tolstoy, whose creative paths passed through the Caucasus, including Azerbaijan, and whose activities were closely related to the Caucasian countries, yielded successful results. The local words specific to Azerbaijani Turkic that we discovered in their works, especially in works on the Caucasus theme, reflect the life, everyday life, and people of the Caucasian peoples with all their characteristic features.*

**KEYWORDS**
*Caucasus, Azerbaijani turkish, Turkic languages, language exchange*

**ARTICLE HISTORY**
Received: 12.03.2025
Accepted: 05.05.2025

[1] Doctor of Philological Sciences, Professor, Azerbaijan State Pedogogical University. Azerbaijan. https://orcid.org/0000-0002-4985-8134 | proftomris@gmail.com

 

## Giriş

Qədim tarixə malik olan və beş tarixi mərhələdə gerçəkləşən rus və türk dillərinin qarşılıqlı fəaliyyəti, xüsusilə XVI–XIX əsrlərdəki rus müstəmləkəçiliyi dövründə mühüm bir mərhələni təşkil edirdi. Bu dövr ərzində keçmiş Kazan, Həştərxan, Sibir, Kırım xanlıqları və Orta Asiya ilə yanaşı, Qafqaz xalqlarının da idarə olunması Rusiyaya həvalə edildi. Beləliklə, bu dövr, əsasən, türk xalqlarının və onların dillərinin formalaşması ilə yanaşı, Şərqi slavyan xalqlarının, eləcə də onların dillərinin qarşılıqlı fəaliyyəti ilə xarakterizə olunur. Bu əlaqələr XX əsrdən başlayaraq, yeni sosial şərtlər və onların qarşılıqlı münasibətlərindəki dəyişikliklərlə zənginləşərək günümüzədək davam etməkdədir. Türk və Şərqi slavyan xalqlarının tarixi, iqtisadi, etnoqrafik və coğrafi sahələrdəki mürəkkəb əlaqələri həmçinin Azərbaycan mühitindən keçən türk leksik vahidlər vasitəsilə bir daha nümayiş olunur. Rus dilində əsrlər ərzində istifadə olunan türk mənşəli sözlər, xüsusilə də Qafqaz yolu ilə Azərbaycandan keçən türk sözləri ilə daha da zənginləşmişdir. Nəticədə, Qafqazın türk mədəniyyəti, etnoqrafik xüsusiyyətləri və yerli sözlər rus ictimaiyyətinə çatdırılır. Bu proses Azərbaycan türkləri ilə yanaşı, Qafqazın digər türksoylu xalqlarının mədəniyyəti, tarixi və dilləri ilə daha dərindən tanışlıq üçün bir zəmin yaratmışdır.

## Metodlar

Məqalədə təsviri və müqayisəli metodlardan, eləcə də müasir linqvistik təhlil üsullarından istifadə olunmuşdur.

## Nəticələr

Qafqaz ölkələrinə, o cümlədən, Azərbaycana gələn və bu diyarların füsunkar, ekzotik gözəlliyinə valeh olan, onların mərd və qəhrəman xalqını sevən, bu ölkələrdə ümumünsiyyət vasitəsi olan türkcəni müəyyən dərəcədə öyrənən görkəmli rus yazıçılarının – (İvan Bunin, Puşkin, Bestujev-Marlinski, Lermontov, Veltman, Tolstoy, Kuprin, Polejayev və başqalarının) əsərləri üzrə toplanmış zəngin bədii faktlar həmin ölkələri bir çox mühüm cəhətləri ilə səciyyələndirən və dəyərli milli xüsusiyyətləri təsvir edən lüğəvi vahidlərdir. Bu lüğəvi vahidlərin əksəriyyəti həmin yazıçıların ədəbi-bədii əsərləri vasitəsilə rus dilinə keçmiş və anlaşıqlı sözlərə çevrilmişdir. Məsələn, *papaxa, kaymak, raxat-lukum, vizir, toy (toplantı), aka, suçuk, araka, şandal (şamdan), bayram, tuzluk, bek, çixir, kourma, xabar, delibaş*... və s.

bu kimi sözlər rus dilində sabitləşmiş, artıq ilkin vaxtlardakı ekzotik səciyyələrini itirmişlər.

**Müzakirə**

Qafqaz ölkələrinin Rusiya idarəsinə keçməsilə başlanan yeni dövr, əslində, böyük və fərqli bir epoxanın başlanğıcı idi. Belə ki, Qafqazın, o cümlədən Azərbaycanın Rusiya tərəfindən istilası ilə bu xalqların tarixində yeni müstəmləkə xarakterli bir həyata – epoxaya daxil olmağı ilə yanaşı, digər tərəfdən bu yaxınlaşma Qafqaz xalqlarının iqtisadi, ictimai və mədəni həyatında xüsusi bir oyanmaya səbəb oldu (Bagretion-Mukhraneli, 2016, s. 6). Bu dövrdə ən güclü təzahür edən və parlaq boyalarla gözə çarpan yeni münasibətlər və inkişafda olan rus mədəniyyəti ilə tanışlıq idi. V. Q. Belinski əsərlərində qeyd edir ki, "Qafqaz elə bil istedadların beşiyi, rus şairlərinin şeir ilahələrinin ilhamvericisi, onların poetik vətənləri olmaq üçün yaranmışdı" (Belinskiy, 1974, s. 113).

Bu baxımdan, A. P. Çexov 9 oktyabr 1888-ci ildə yazıçı Dmitri Vasilyeviç Qriqoroviçə yazdığı məktubda qeyd edirdi: "Yayı mən xarüqüladə keçirdim. Kırıma, Batuma və Bakıya getdim… Əgər mən Qafqazda yaşasaydım, orada ancaq nağıllar yazardım. Ecazkar ölkədir" (Nuriyeva, Təkləli, 2010, s. 32).

Rus ədəbiyyatında Şərqə maraq, türk aləminə heyranlıq qədim tarixi ənənəyə malikdir: "Şifahi xalq yaradıcılığı nümunələrində Şərq motivləri ilə qarşılaşmamız heç də təsadüfi deyil. Həqiqətən, Şamaxı şahzadəsinin zərxara ipəyi, geyimi və xarakteri ilə rus xalq mahnılarında qarşılaşmaq mümkündür" (Əl-Abbas, 1998, s. 12).

Bunlarla yanaşı, qabaqcıl rus mədəniyyəti ilə yaxınlıq Qafqaz ölkələrində müxtəlif elmlərin sürətli inkişafına da təkan vermişdir. Rus alimlərinin təşəbbüsü ilə nəşr olunan "Сборник материалов для описания местностей и племен Кавказа" (СМОМПК) məcmuəsi rus ziyalılarının Qafqazla tanışlığına şərait yaratmışdı. Məlum olduğu kimi, orta əsrlərdə də Azərbaycan türkcəsi Qafqaz xalqlarının anladığı və istifadə etdiyi bir dil olmuşdur. Buna görə də XIX əsrin əvvəllərində rus ziyalılarının qarşılaşdığı mühitin ünsiyyət dili türkcə olmuşdur. Rus ziyalılarının tanış olduğu türk dünyası onların bədii təfəkküründə yeni, fərqli duyğular oyandırdı.

Əslində, rus üsul-idarəsinin Qafqazda bərqərar olduğu illərdən də əvvəl türk dilinin (xüsusilə, Azərbaycan türkcəsinin) ümumanlaşma vasitəsi olması qədim tarixə malikdir. Professor Tofiq Hacıyevin yazdığına görə, Azərbaycan dilinin Qafqazda, ümumən Yaxın Şərqdə kütləvi ünsiyyət dili və şöhrəti XIII əsrdən təsdiq

olunur... Hətta qonşu dillərə ərəb və fars sözləri Azərbaycan dili vasitəsilə keçimişdir (Hacıyev, 2012, s. 14). Qeyd etdiyimiz kimi, türkcə (xüsusilə Azərbaycan türkcəsi) hər zaman Qafqazın müştərək dili olmuş və demək olar ki, yeganə anlaşma vasitəsi kimi istifadə edilmişdir.

Tarixçi Leo (əsl adı Babaxanyan Arakel Qriqoryeviç (1860–1932)) "Erməni tarixi" kitabında yazır: "Türk dili nağıllarda, nəğmələrdə təsvir olunan həyatı ifadə etmək üçün erməni xalq ağızlarından daha səlis, daha ifadəli və daha zəngindir" (Seyidov, 1954, s. 59). Keçən əsrlərdə canişinliyin mərkəzi olan Tiflis şəhəri Şərq mədəniyyətinin parlaq təzahürlərini, türkcənin nəzərəçarpacaq üstünlüklərini əks etdirən mədəni-inzibati bir paytaxt idi: XVIII əsrdə Tiflisdə yaşamış erməni şairi Sayat Nova və bir çox erməni şairlərinin (onların sayı 375 nəfərdən çoxdur) türkcə əlyazmaları Tiflisin yerli tərkibini təşkil edən türk mühiti ilə bağlı idi (Seyidov, 1954, s. 84; Ramazanov, 1977, s. 20–21). Qeyd edək ki, hər hansı bir dilin başqa xalqın poeziyasında belə bir hüquq qazanması, şübhəsiz, o dilin əsrlər əvvəl həmin xalqın içərisində şeir dili səviyyəsinə yüksəlməsini və inkişaf etməsini tələb edirdi. Təkcə dili bilməklə deyil, ədəbi dilin üslubu, bədii təsvir vasitələri və s. haqqında mükəmməl bilik və təcrübəyə malik olmaq vacib şərtlərdəndir.

Ruslar "Rusiyanın Şərqi" adlandırdıqları Qafqaz ölkələrinə ayaq basarkən də türk dili ümumanlaşma vasitəsi olaraq qalmaqda idi (Bagration-Mukhraneli, 2016, s. 5). Məşhur rus şairi M. Y. Lermontov bu barədə öz dostu S. A. Raevskiyə Tiflisdən göndərdiyi (1837-ci il oktyabr-noyabr) məktubunda yazırdı: "…Tatar dilini öyrənməyə başlamışam. Fransız dili Avropada zəruri olduğu kimi, bu dil də burada və ümumiyyətlə, Asiyada zəruridir" (Lermontov, 1965, s. 411). Qafqaz 22 yaşlı Lermontovun ilham qaynağı idi. Onun bu mövzuda yazdığı "Hacı Abrek", "Demon", "İsmail bey", "Mtsıri" (gürcü dilində: "yeni xaçlanmış" deməkdir), "Terek nehrinin töhfələri", "Döyüş", "Valerik", "Tamara", "Görüş", "Kazbekə", "Qaçak", "Qafqaz", "Qanlı", "Xəncər", "Yuxu" şeirləri və "Zəmanəmizin qəhrəmanı" povesti rus ədəbiyyatının uğurlu əsərlərindəndir. Qafqazda yaşamış və fəaliyyət göstərmiş digər ədəbiyyatçılar kimi, Lermantovun əsərlərində də tez-tez rast gəlinən: *ana, saz, mövlam, aşık, yok, yaman, tuzluk, oğlan, caneçka, şindi* və s. bu kimi kəlmələr şairin türk dillərinə maraq və diqqətinin göstəricisidir.

Qafqazda yaşayıb-yaratmış yazıçılar kimi buraya döyüş üçün göndərilən rus hərbi qulluqçular arasında üsyankar ruhlu gənc şair Aleksandr Polejayevin də ən təsirli və yetkin əsərləri sırasında əsas yeri Qafqazda yazdığı şeirlər təşkil edir. Döyüşərək Qafqazı qarış-qarış gəzən, qılıncı ilə özünə yol açan bu şair ruhlu əsgər

gördüklərindən çox mütəəssir olur, qəlblərə sirayət edən şeirlər yazır. "Kermencik məzarlığı", "Erpeli", "Kubanda gecə", "Çır Yurt" əsərləri onun acı müşahidələrinin məhsuludur. Bu əsərlərdə işlənən *şamxal, aul, toxda* (dayan), *ber, abaz, bayram, çurek, koşkildi, saman, amanat* və s. kimi türk sözləri şairin işlədiyi mövzulara həssaslığını və diqqətini göstərir (Nuriyeva, 2010, s. 86).

Qafqaz elmi araşdırmalar mənbəyi kimi, zaman-zaman yadellilər tərəfindən öyrənilib tədqiq edilirdi. Rus müəlliflər hər bir məqamda onun coğrafi və etnoqrafik özəlliklərini dəqiqliklə tərənnüm etməyə çalışırdılar. Məsələn, Yakov Polonski Qafqaz mövzusunda yazdığı əsərlərində istifadə etdiyi *katibi* (qadın üst geyimi), *liçak* (ləçək), "baş örtüsü" kəlmələrinin mənasını rus oxucularına çatdırmaqla yanaşı, bu əşyalarla bağlı məlumatları da onlara ötürürdü.

Tarixən türk dillərinin rus dili ilə əlaqəsi erkən əsrlərdən başlamış və sonrakı dövrlərədək davam etmişdir. Ruslar XIX əsrdə Qafqaz ölkələri ilə ardıcıl əlaqəyə girdikləri zaman Çar çanişinliyinin mərkəzi Tiflisin özündə türk dilinin təsirilə çulğalaşmış mühitlə qarşılaşmalı oldular. Artıq onlar Tiflisdə yerli danışıqda üstünlük təşkil edən türkcəni ümumünsiyyət vasitəsi olaraq qəbul etməli olurlar. O zaman rus qoşunlarının tərkibində Qafqaza gələn və Tiflisdə Puşkinlə görüşən (1829) K. İ. Savostyanov həmin axşamı (dostu V. P. Qorçakova yazdığı məktubunda) olduğu kimi canlandırmaq üçün vacib olan yerli koloriti yerli dil vasitəsilə dəqiqliklə təsvir edir: Тут была *зурна* и *тамаша* и лезгинка и заунылая персидская песня (şübhəsiz, müəllif memuarist bir çoxları kimi bu ad altında Azərbaycan muğamlarını nəzərdə tutur) и ахало и *алаверды* и *якшы ол* и… (Veresayev, 2018, s. 241).

Göründüyü kimi, Qafqaz ölkələrində yaşamış və bu ölkələrdən yazıb-yaratmış ədəbiyyatçılar − Puşkin, Qriboyedov, Lermontov, Aleksandr Polejayev buranın coğrafi və etnoqrafik özəlliklərini dəqiqliklə təsvir etməyə çalışırdılar. Məsələn, Yakov Polonski, Bestujev-Marlinski, Lev Tolstoy, Aleksandr Qriboyedov və digər böyük sənətkarlar rus oxucularını bu ölkələrlə tanış etmək məqsədilə əsərlərində türk sözlərinə geniş yer verirmişlər. Bu səbəbdəndir ki, türk-rus əlaqələrində tamamilə yeni olan bu dövr, başlıca olaraq rus dilinə yeni və güclü təsiri ilə xarakterizə olunur. Rus dilində yazılan bədii əsərlərdə işlənən türk sözləri sayəsində bu dilin bir çox zəngin elementləri artmağa başlayır. Qafqaza sürgünə göndərilmiş dekabrist ədəbiyyatçı Nikolay Bestujevin (Marlinskinin) 30-cu illərin ortalarında yazdığı oçerklərdə etnik və linqvistik materiala əsaslanması (çox sayda türk sözlərindən istifadə etmişdi) realizm nümunələri kimi qiymətləndirilə bilər. Qafqazda yazdığı

povest və oçerklərində müəllif ecazkar metaforalar, parlaq rənglər çəkmiş, təhkiyəsini yüksək hiss və həyəcanla yoğurmuşdu. Bunlar 30-cu illərin rus nəsri üçün əhəmiyyətli idi. Bununla da Bestujev-Marlinski bu vaxta qədər nəsrdə hökm sürən üslub yoxsulluğunu dəf edə bilmişdi (Gadjiyev, 1989, s. 14–15).

Qafqaza yaxından bələd olan, onu daha dərindən tanımağa və öyrənməyə çalışan şair-döyüşçü ayaq basdığı Dağıstan ərazilərində və Dərbənddə, o cümlədən Azərbaycanın Şamaxı, Qəbələ və digər bölgələrində ilk eşitdiyi sözlərin türk dilində olduğunu qeyd etmişdir.

Türk kəlmələri təbəqəsinə Qafqazlar yolu ilə keçmiş olanları da əlavə etməklə bu mənzərəni daha da zənginləşdirmək mümkündür. Buraya yerli və milli xüsusiyyətləri canlandırmaq məqsədi daşıyan *tuzluk, kaçağa, beşlik, paşa, paşalık, toy* (toplantı), *bek, uzden* (özdən) zadəgan, *nuker* (mühafizəçi), *kapan* (böyük tərəzi), *duxan* (dükan), *baranta* (yağmalamaq), *gurda, çavuş, kinjal, kunak, cigit, cikitovka, çarvodar, aqaç* (uzunluq ölçüsü), *kunak* kimi sosial-inzibati; *bekmez, ayran, buza, çixir, kumus, xurma, lavaş/levaş, levaşnik, çurek, pilav, çeburek, arak, kaçkaval* (pendir növü) yemək-içki adları; *karağaç, çinar, samşit* (şümşad), *ayva, şeptala, badrijan, alıça/lıça, injir*-bitki və ağac adları; *beşmet, çuxa, katibi, çapan, kazakin, liçak, arxalık, arakçinka, çalma, papaxa* – geyim adları; *kilim, burdyuk, manqal, mutaka, yuluk, tulukçu, ayak* (bardak) kimi yaşayışla bağlı kəlmələr; *maral, çakal, djeyran, işak, loşak, kater, turaç* – heyvan, quş adları və s. sözləri əlavə edə bilərik. Qeyd olunan türk sözləri rus dilinin etimoloji lüğətlərində əks olunmuşdur (Fasmer, 1986–1987).

Hər hansı bir xalqın xüsusi milli cizgiləri (siyasi həyat tərzi, məişəti, mərasimləri) ilə bağlı olan bu cür leksikadan istifadə sırf dil tələbatı ilə deyil, mövzu ilə, nitq şəraiti ilə bağlı olduğundan, belə sözlər öz mənaları ilə əvvəllər realiya (ekzotik sözlər) olmuşlarsa, hazırda rus dilində işlənən lüğəvi vahidlərdir (Gadjiyev, 1989, s. 39–40). Odur ki tatar türkoloqu Ruziya Yunaleyevanın bu kimi hallarla bağlı ifadə etdiyi "dildə alınma sözlərin əksəriyyəti tarixən ekzotizmlər səciyyəsində çıxış etmişlər; alınmalarla ifadə olunan realiyaların hələ yad dərk olunması onların dilin leksik sisteminə birdəfəlik daxil olmasını ləngidirdi" fikrinə şərik olmamaq mümkün deyil (Yunaleyeva, 1978, s. 21). Digər ekzotik leksikanın vahidlərindən fərqli olaraq, realiyaların tərcüməsi çox zaman baş tutmur, yəni dildə bunların tam paralellərini tapmaq mümkün olmur. Məsələn, rus dilinin özündə "гость" sözü olduğu halda, *kunak* söz-realiyasının işlənməsi onunla bağlıdır ki, *kunak* sözü bütöv xalqı xarakterizə edən etnoqrafik tutuma malikdir. Evə gələn hər bir qonaq "гость"

adlanır, bununla yanaşı, ailənin, yaxud tək bir adamın kənardakı dostu, tanışı, etibar etdiyi adam da "qonaq" adlanır. Məsələn, Leskovun "Островитяне" əsərindəki *"Он рубил своих за басурманки с которой был знаком и считаться кунаком ее брату"* misalı bu realiyanın dilə necə daxil olduğunu göstərir. "Kunak" sözünün mənası nə qədər tutumlu olsa da, əsas xətt kimi burada etibarlı dost, qonaq, qardaş mənasında istifadə edilir. L. Tolstoyun "Kazaklar" əsərində "kunak" sözü dost, arxa, tanış, etibar olunan adam mənasında tez-tez rast gəlinən vahiddir. Məsələn, yazıçının əsərlərindəki "Гирей хану верить можно, его весь род – люди хорошие; его отец верный *кунак* был; Зато у меня все Чечня *кунаки* были; Мы с тобой *кунаки* будем, – сказал дядя Ерошка" kimi nümunələrdə "kunak" sözü bu mənada işlədilmişdir.

Fikrimizcə, rus dilində istifadə edilən *balık, karqa, izyum, parça, şandal* kimi türkizmlər əvvəlcə bu dildə realiyalar kimi işlənmişdir. Çünki rus dilində həmin mənanın tam paralelləri olan *рыба, ворона, виноград, ткан, материя, подсвечники* kimi sözlər də çox işləkdir. Bununla yanaşı, keçən yüzillər boyunca rus dilində işlənərək artıq sabitləşən bir çox türk kəlmələri Qafqaz ölkələrində olmuş müəlliflər tərəfindən mənbə dilinə daha yaxın şəkildə işlənməyə başlayır. Məsələn: *çuxa-çuyka* (2-ci sırada verilənlər türk sözünün rus dilində sabitləşmiş formasıdır); *çekal / şakal; abas / abaza; çavuş / çeuş; derbış / derviş; enaçarı / yanıçarı; badrijan / baklajan; xarbuza / qarbuz / arbuz; arapa / arba; qaytan / kaytan; keyf / kayf; arxaluq / arkalık; esir / yasir; kisa / kiset; xarem / qarem; baxça / bakça; bek / bey/ bay; çok / çokom* və s. faktlar etnik anlayışları yaxınlaşdıran linqvistik vasitə kimi maraq doğurur.

Nəticə olaraq, qeyd etməliyik ki, rus dilində işlənən türkizmlərin bir qismi mənbə dilin formalarına yaxın işlədilmiş və rus dilində mövcud türkizmlərlə paralel şəkildə istifadə edilmişdir. "Şalvar" (şarovar), "çuxa" (çuyka), "iqid" (djiqit), "çakal" (şakal), "esir" (əsir, plen), "kisa" (kiset), "arapa" (arba), "derman"(durman), "yapundja" (epança), "dilmaç" (tolmaç), "karvan" (karavan) və s. sözlər milli xüsusiyyətləri canlandıran faktlar olaraq qeyd edilə bilər.

Beləliklə, türk mənşəli sözlərin rus dilində işlənməsiylə ortaya çıxan məsələlərdən biri də əsrlərcə bu dildə istifadə olunan türk sözlərinin bəzi əsərlərdə mənbə dilə yaxın, daha dəqiq desək, bu dillərdəki sözlərlə eyni şəkildə istifadə edilməsidir. Bununla da, rus dilində işlədilmiş türk mənşəli kəlmələrdə ma raqlı hal olan fonetik-orfoqrafik variantlar ortaya çıxmışdır. Yəni Qafqaz ölkələrində olmuş müəlliflər öz əsərlərində bu sözləri digər yazarlardan fərqli anlam və fonetik yöndən

dəyişik hallarda işlətməli olmuşlar. Məsələn, geyim adları qrupuna aid edilən rus dilindəki *çuyka* türk sözü Qafqaz ölkələrində olmuş müəlliflərin əsərlərində çuxa (чуха) formasında – Azərbaycan türkcəsində olduğu kimi işlənilir: *На его поношенном сутулом теле самая* ***чуха*** *его была уже значительно поношена* (Яков Полонский. Тифлисские сакли). Bunun kimi, türk dilindəki *patlıcan* sözünün rus ədəbi dilində "badrijan" olaraq işlədilməsi bu sözün məhz Azərbaycan və onunla əlaqədar olan mühitdən keçdiyinə sübutdur (Dmitriyev, 1962, s. 525). Rus dilindəki mühüm, zəruri sözlərdən olan *şarovar (шаровар)* türk kəlməsi Qafqazda olmuş Lev Tolstoyun, Aleksandr Kuprinin, Yakov Polonskinin və b. əsərlərində əslinə uyğun şəkildə – "şalvar" şəklində *(Хвилкин лежал в это время на диване в красных канаусовых* ***шалварах*** (Я. Полонский. Квартира в татарском квартале) istifadə edilmişdir.

Rus müəllifləri türk mühitinin bərqərar olduğu Qafqaza yaxınlaşdıqca, o mühiti daha dərindən öyrəndikcə bu fərqlər azalır. İvan Buninin "Qafqaz" əsərində rus ədəbi dilindəki "şakal" türkizminin yerli variantı təbii şəkildə istifadə edilərək daha uyğun bir təsvir yaratmışdır: *"Тогда в лесах просыпались и мяукали орлята, ревел* ***барс****, тявкал* ***чекалки****"*. L. Tolstoyun Qafqaz mövzusunda qələmə alınmış əsərlərində də eyni halı müşahidə edirik: *"Все одно, пробормотал прохожий, пролезая между колес столкнувшихся повозок, видно, тоже* ***харбуза*** *купить повечерять"* (Tolstoy, 1855).

Müşahidə etdiyimiz faktlardan aydın olur ki, Qafqazla bağlı həyatın, məişətin, xüsusən insanların təbii koloriti və xarakteri yerli sözlər vasitəsilə təsvir edilmişdir.

## Nəticə

Beləliklə, XIX əsr Qafqazın, o cümlədən Azərbaycan dilinin rus yazıçıları tərəfindən "kəşfi" dövrü adlandırıla bilər. Nəticədə, rus dilindəki türk mənşəli sözlərin tərkibi artıq Qafqaz-türk mühitindən, xüsusilə Azərbaycan türkcəsindən keçən sözlərlə zənginləşmişdir. Bu qəbildən olan sözlər rus dilinin ümumi leksikasında möhkəmlənərək özünə vətəndaşlıq hüququ qazanmış dil vahidinə çevrilmişdir. Bu sözlər elm və mədəniyyətin müxtəlif sahələrinə aid terminlərin böyük bir hissəsini təşkil edir və siyasi-ictimai, sosial-mədəni, etik-estetik fikirlərin ifadəsi üçün Şərqi slavyan, o cümlədən rus dilinə öz bəhrələrini vermiş, rus ədəbi dilinin türk dillərindən alınmalar hesabına zənginləşməsi işində türk dillərinin güclü mənbə və vasitəçi rola malik olması üzə çıxarılmışdır.

**Ədəbiyyat**

1. Hacıyev, T. (2012). *Azərbaycan ədəbi dili tarixi* (2 cilddə, II cild). Elm.
2. Nuriyeva, M. (2010). *Rus dilində türk sözləri*. “Nurlar” nəşriyyatı.
3. Ramazanov, Y. (1977). *Azərbaycan dilində yazıb-yaradan erməni aşıqları* (XIX əsr). Elm.
4. Seyidov, M. (1954). *Sayat-Nova*. Azərb. EA-nın nəşriyyatı.
5. Al-Abbasi Noval Kheyri. (1998). *Vostok v dekabristskoy literature do 14 dekabrya 1825 goda i tvorchestve V. K. Kyukhel'bekera*. Dissert. na soiskanie kandydata filologicheskikh nauk. Bakin'skiy Gosudarstvennyy Universitet.
6. Bagrat'ion-Mukhraneli, I. L. (2016). *Reprezentatsiya Gruzii i Kavkaza v Russkoy literature XIX – nachala XX veka*. Dissertatsiya na soiskanie uchenoy stepeni doktora filologicheskikh nauk.
7. Belinskiy, V. G. (1974). *Izbrannye stat'i*. Tsentral'no-Chernozemnoe knizhnoe izdatel'stvo.
8. Dmitriyev, N. K. (1962). *O t'yurkskikh elementakh russkogo slovarya. Stroy t'yurkskikh yazykov.*
9. Fasmer, M. (1986–1987). *Etimologicheskiy slovar' russkogo yazyka v 4-kh tomakh*. Progress.
10. Gadzhiev, A. (1989). *Vokrug Pushkina*. Izdatel'stvo Yazychy.
11. Lermontov, M. Yu. (1965). *Sobranie sochineniy v chetyrekh tomakh*. T. 4. Khudozhestvennaya literatura.
12. Veresaev, V. (2018). *Sputniky Pushkina. 1827–1837*. V 2-kh tomakh, t. 2. Izdatel'stvo Pal'mira.
13. Yunaleeva, R. (1978). Leksiko-semanticheskoe razvitie t'yurkskikh nazyvaniy glavnykh uborov v russkom yazyke. *Sovetskaya t'yurkologiya*, 5, 20–25.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 22–34
https://doi.org/10.48445/i7714-5058-6966-k

# Poetik dil və hikmətli sözlər

***Sədaqət Həsənova*** [1]

**XÜLASƏ**
*Məqalədə Azərbaycan poetik dilinin linqvistik xüsusiyyətlərindən bəhs olunur. Bu məqsədlə aforizmlər ön plana çəkilir, müxtəlif dövrlərdə yaşayan şairlərin dilindən götürülmüş hikmətli ifadələr araşdırılaraq atalar sözləri ilə müqayisə edilir. Məqalədə şairlərin qələminə məxsus olan hikmətli fikirlər "müəllifli atalar sözləri" adlandırılır. Azərbaycan poetik dilindən alınmış aforizmlər xalqın mədəniyyətini, əxlaqını, söz söyləmək qabiliyyətini ifadə edən faktlar hesab edilir. Onlar bir tərəfdən də söz sənətkarlarının düşüncə zənginliyinin məhsulu kimi dəyərləndirilir. Məqalədə irəli sürülən elmi-nəzəri fikirlər dil materialları ilə əsaslandırılır.*

**AÇAR SÖZLƏR**
*söz, dil, ifadə, aforizm, məna*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 01.02.2025
Qəbul edilib: 22.04.2025

[1] Filologiya elmləri doktoru, professor, Naxçıvan Dövlət Universiteti. Azərbaycan.
https://orcid.org/0009-0002-9996-6229 | sedagethesenova@gmail.com

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 22–34
https://doi.org/10.48445/i7714-5058-6966-k

# Poetic Language and Words of Wisdom

***Sadagat Hasanova*** [1]

**ABSTRACT**
*The article talks about the linguistic features of the poetic language of Azerbaijan. For this purpose, aphorisms are brought to the fore. Wise expressions taken from the language of poets living in different eras are examined and compared with proverbs. In the article, the wise thoughts written by the poets are called "authorial proverbs". Aphorisms taken from the poetic language of Azerbaijan are considered to be facts that express the culture, morals, and speaking ability of the people. On the one hand, they are valued as the product of the richness of thought of the artists of the word. Scientific-theoretical ideas put forward in the article are justified by language materials.*

**KEYWORDS**
*word, language, phrase, aphorism, meaning*

**ARTICLE HISTORY**
Received: 01.02.2025
Accepted: 22.04.2025

[1] Doctor of Philological Sciences, Professor, Nakhchivan State University. Azerbaijan.
https://orcid.org/0009-0002-9996-6229 | sedagethesenova@gmail.com

 

## Giriş

Azərbaycan poetik dili qədimiliyi və zənginliyi ilə seçilən maraqlı qaynaqlardandır. O, xalq təfəkkürünün tarixi inkişafını, nitq mədəniyyətinin keyfiyyətlərini özündə yaşadaraq zamandan zamana, nəsildən nəsilə çatdırır və onu unudulmağa qoymur. Azərbaycan poetik dili özünəməxsus xüsusiyyətləri ilə də fərqlənir. Onun maraqlı və yaddaqalan cəhətlərindən biri atalar sözlərinə yüksək münasibət bəsləməsi və söz sənətkarlarının qələminə xas olan hikmətli fikirləri ifadə etməsidir. Poeziyanın dili üzərində aparılan araşdırmalar onun linqvistik baxımdan tədqiqini əsaslandırır.

## Metodlar

"Poetik dil və hikmətli sözlər" adlı tədqiqatın aparılması zamanı dil elementlərinin daxili quruluşunu, əlaqələrini və sistemliliyini öyrənmək üçün təsvir, hikmətli söz müəllifləri arasında paralellər qurmaq, oxşarlıqları və fərqləri üzə çıxarmaq məqsədilə müqayisə və Azərbaycan poetik dilində hikmətli fikirlər haqqında təsəvvür yaratmaqdan ötrü təhlil metodlarından istifadə olunmuş, material olaraq müxtəlif şairlərin yaradıcılıq örnəklərinə müraciət edilmişdir.

## Nəticələr

Araşdırma aşağıdakı fikirlərlə nəticələnmişdir:

1. Müxtəlif söz sənətkarlarının yaradıcılığından alınmış hikmətli sözlərin zənginliyi Azərbaycan poetik dilinin bu baxımdan çox dəyərli bir qaynaq olduğunu təsdiq edir.
2. Azərbaycan poetik dilində işlənən hikmətli fikirlərin məna çəkisi, təqdimedilmə mədəniyyəti, ifadə sanbalı folklor örnəkləri olan atalar sözləri ilə müqayisəyə imkan verir və buna görə də onları "müəllifli atalar sözləri" kimi dəyərləndirmək olar.
3. Hikmətli fikirlərin işlənmə ənənəsi tarixən qədimdir və "Kitabi-Dədə Qorqud" dastanında onlardan ustalıqla istifadə edilib. Bu ənənə indi də davam edir və daha çox poetik dil ilə əlaqəlidir.

## Müzakirə

Poetik dil tərbiyəvi və mənaca dolğun hikmətli sözlərin qaynağıdır. Bu sözləri "müəllifli atalar sözləri" kimi dəyərləndirmək olar. Azərbaycan ədəbiyyatında

aforizm istifadə edilməyən şifahi və yazılı abidə tapmaq mümkün deyil. Nümunə olaraq, “Kitabi-Dədə Qorqud” dastanını oxuyarkən oradakı hikmətli fikirlərin dərinliyinə heyrətlənməmək mümkün deyil.

Ulaşuban sular daşsa, dəniz dolmaz.
Təkəbbürlik eyləyəni Tanrı sevməz.
Könlin yuca tutan ərdə dövlət olmaz.
Yad oğulı saxlamaqla oğul olmaz.
Böyüyəndə salur gedər, gördüm diməz
(Kitabi-Dədə Qorqud, 2004, s. 19).

Ər, malına qiymayınca adı çıqmaz.
Qız anadan görməyincə ögüt almaz.
Oğul atadan görməyincə süfrə çəkməz
(Kitabi-Dədə Qorqud, 2004, s. 20).

Azərbaycan ədəbiyyatında aforizmlərə həsr edilmiş çox sayda kitablar nəşr olunmuşdur. Bu sahədə Azərbaycanın görkəmli sənətkarları N. Gəncəvi və S. Vurğunun kitablarını nümunə göstərmək olar. Şairlərin atalar sözləri səviyyəsində olan bir sıra hikmətli ifadələr dilimizin aforizmlər salnaməsinə yazılmağa dəyər. Bu baxımdan, Nəsiminin aşağıdakı fikirləri diqqətəlayiqdir:

Ey Nəsimi, aqibət varır yelə,
Bivəfa ilə yeyən nanü-nəmək
(Nəsimi, 2017, s. 105).

Canda ki eşq olmadı, dildə xəbər nə faidə?
Gözdə ki görmək olmadı, nuri-bəsər nə faidə?
Ey Nəsimi, sən fələkin gərdişindən qəm yemə,
Şadlıq əbduh iləndir, həm qızılgül xar ilən
(Nəsimi, 2017, s. 157).

Fəraqı çəkməyən aşiq vüsalın qədrini bilməz və s.

Azərbaycan xalqına xas atalar sözlərindən olan “Qurd qocalanda köpəyə gülünc gələr” fikrinə Aşıq Qurbaninin dilində qarşılaşırıq:

Məsəldi, deyərlər: “Qurd qocalanda
Tülkü meydan açıb, dovşan gülərmiş”
(Qurbani, 2006, s. 83).

Ədəbi dilimizin müxtəlif mərhələlərinə aid poetik əsərlərdə atalar sözlərinin dəyərini əks etdirən fikirlərlə tez-tez rastlaşırıq. Bu baxımdan, Molla Cumanın dili bir sıra tərbiyəvi fikirlər və hikmətli ifadələrin zənginliyi ilə seçilir:

Bədəsil dost olan şadiman gəzməz,
Nə hörmət eyləsən, ürəyi qızmaz.
Əsil dost sizinlə dostluğu üzməz,
İstərsə boynuna yüz qılınc dəyə
(Molla Cümə, 2006, s. 89).

Gerçək sözdür, mərd namərdə qarışmaz,
Vəfasıza vəfalı dost darışmaz gərək
(Molla Cümə, 2006, s. 95).

Verimli ağıldan heç ağıl olmaz,
İgidin öz ağlı başında gərək
(Molla Cümə, 2006, s. 155).

Bir misaldır, atalardan qalıbdır,
Yabaya dözməyən xırmana girməz gərək
(Molla Cümə, 2006, s. 422).

Elin arasında adam yoxlanır gərək

(Molla Cümə, 2006, s. 111).

XX yüzillikdə Azərbaycan poetik dilində atalar sözlərinin yazılı dildəki varisləri sayılan hikmət dolu əsərlərin çoxluğu diqqəti cəlb edir. Bu baxımdan, İslam Səfərlinin şeirlərində bir sıra özünəxas aforistik məzmunlu ifadələr xüsusilə vurğulanır:

El özü qoruyar axarlı şeiri
(İslam Səfərli, 2005, s. 13).

Sözü dumanlı deyən
Bir çən olub sovuşar.
Eli sevən sənətkar
Eldən-elə qovuşar
(İslam Səfərli, 2005, s. 27).

Qəlb göynəyər, göz dolar
(İslam Səfərli, 2005, s. 136).

Gözələ göz dəyər,
Qəlbə söz dəyər.
Hicrana düşən
Vüsal gözləyər
(İslam Səfərli, 2005, s. 138).

Sənətkar susanda millət kar olar
(İslam Səfərli, 2005, s. 174).

Ana dilini dillərin tacı hesab edən şair dilə olan münasibəti doğru bir əqidə kimi dəyərləndirir və bu xəzinənin sadə və mənalı sözlərindən öz yaradıcılığında ustalıqla istifadə edir.

Zəngin söz ehtiyatına malik olan sənətkarlar dilin dərinliyinə qədər enərək düşüncələrini orijinal ifadələrə çevirə bilirlər. Sözlər təfəkkür və düşüncələr dünyasının açarı, insanın daxili aləmini bəyan edən, könlündən keçənləri ifadə edən ən gözəl bələdçidir. İ. Səfərli sözlər xəzinəsini açmağı bacaran və bu yolda sadəliyə önəm verən bir sənətkar olaraq ədəbi dilimizin zənginləşməsinə layiqincə xidmət göstərmişdir. O, "tərif azarına tutulanları", "neçə qələm əhlindən neçə yüz calaq edənləri", "dili dolaşıqları" qınamış, yeni fikri, təzə sözü şeirin məziyyəti kimi qəbul etmişdir:

Bu bir gerçəklikdir ki:
Vətən üçün, xalq üçün
Söz qalacaq dünyada
(İslam Səfərli, 2005, s. 28).

Zeynal Cabbarzadənin şeirlərindəki hikmətli fikirlər onun dünyaya baxışını müəyyənləşdirir: O, dilimizin hikmətli fikirlərini zənginləşdirən şairlərdəndir. Şairin bəzi hikmətli fikirlərinə nəzər salaq:

Zəhərli ilanın da
Vardır öz gözəlliyi
(Cabbarzadə, 2005, s. 81).

Çıxarmı heç insanın
əzəl yeri yadından?
(Cabbarzadə, 2005, s. 146).

Düz deyiblər, yaman gündə
Arxa çıxar el içindən,
Arxasız el su götürməz
Durna gözlü göl içindən
(Cabbarzadə, 2005, s. 213).

Vətənin eşqi kimi qüvvəli loğman olmaz
(Cabbarzadə, 2005, s. 102).

Belə aforistik ifadələri "poetik dilin atalar sözləri" adlandırsaq, yanılmarıq. Buradakı fərq epikliklə liriklik arasındadır. Atalar sözləri şifahi xalq ədəbiyyatının epik janrlarındandır. Lakin söz sənətkarlarının yaratdığı aforizmlər lirik janra aiddir. Onları "müəllifli atalar sözləri" kimi dəyərləndirmək yerinə düşər.

Şair Əliağa Kürçaylının dilində çoxsaylı aforistik fikir və ifadələrin də xüsusi üslub özəllikləri vardır:

Əzəli qaydadır: bircə ovuc dən
Səpilsə, göyərib bir zəmi olur
(Kürçaylı, 2004, s. 101).

Ağılsız, vicdansız tədbir görəndə,
Torpaq da insandan qisas alırmış
(Kürçaylı, 2004, s. 108).

Hansı zülm əbədi yerində saydı,
Əriyib getmədi güney qarıtək?
(Kürçaylı, 2004, s. 112).

Çəkilib uzaqdan baxanda ancaq
Hər insan özünə aydın görünər
(Kürçaylı, 2004, s. 113).

Adam səadəti evə çağırmaz,
Adam səadətin dalınca gedər
(Kürçaylı, 2004, s. 121).

Məlumdur ki, atalar sözləri xalqımızın dil və təfəkkür mədəniyyətinin ayrılmaz bir hissəsidir. Yüz illərin, min illərin sınağından çıxmış, ən mükəmməl tərbiyə qaynağı olan və xalqın mənəviyyatını ifadə edən bu gözəl söz-fikir inciləri bədii dildə də öz təsirini əks etdirir. Belə ki, söz sənətkarları atalar sözlərini həm olduğu kimi, həm də müəyyən dəyişikliklər edərək işlədir, eyni zamanda bu prosesin təsiri ilə özləri də atalar sözləri səviyyəsində hikmətli ifadələrin yaradıcısına çevrilirlər. Mirvarid Dilbazinin dilində də belə örnəklərlə qarşılaşmaq mümkündür:

Hər zərbədən bil ki, yıxılmaz ərlər
(Dilbazi, 2004, s. 21).

Bir xalqın başında aqil, mötəbər,
Tədbirli bir başçı durmasa əgər,
O xalqı qurd nədir, tülkülər yeyər
(Dilbazi, 2004, s. 55).

Göyərməz qovrulmuş buğda,
Bar verməz bağbansız bağ da.
Səhrada tək qalmış dağ da
Enə-enə təpələnər
(Dilbazi, 2004, s. 85).

Azərbaycanın söz sənətkarlarının hər biri öz təfəkkürünə uyğun dərin hikmətli fikirlərə imza atmışlar. Bu fikirlərin mövzu dairəsi son dərəcə genişdir. Məsələn, Nəbi Xəzrinin sözə verdiyi qiymət dərin hikmət ifadə edir:

Söz ucaldar bu cahanda insanı,
Əzizləyər bu cahan da insanı.
Vaxt olar ki, bircə anda insanı
Əlli ilin hörmətindən salar söz
(Nəbi Xəzri, 2004, s. 11).

Hüseyn Arifin dilində hikmətli zəngin fikirlərin çoxluğu şairin söz sənətkarlığını ifadə edən əsas cəhətlərdən biri kimi dəyərləndirilir:

Çətin gün həyatın imtahanıdı,
Yaxşını, yamanı tarix tanıdı
(Arif Hüseyn, 2004, s. 54).

Zirvədə zirvənin qədri bilinməz,
O gözdən itəndə heyif deyərlər
(Arif Hüseyn, 2004, s. 165).

Həyatda elindən, günündən iraq,
Kürsüdə millətdən danışandan qorx
(Arif Hüseyn, 2004, s. 212).

Bir kökün üstündə yüz budaq yaşar,
Yüz budaq bir kökü saxlaya bilməz
(Arif Hüseyn, 2004, s. 58).

Zəlimxan Yaqubun yaradıcılığında danışıq dilinə olan meylin qabarıqlığı xalq hikmətindən qidalanan atalar sözü siqlətli deyimlərə meydan verir:

Xalqa sadiq olan kəslər
İçində bir vətən bəslər
(Zəlimxan Yaqub, 2006, s. 165).

Qarşısına haqq çıxar haqq axtaran kəslərin
(Zəlimxan Yaqub, 2006, s. 169).

Min şirin əfsanədən
Bir acı gerçək gözəl
(Zəlimxan Yaqub, 2006, s. 215).

Kim xalqa qənim olub görsə işin tərsini,
Vaxtın geci-tezi var, tarix verər dərsini
(Zəlimxan Yaqub, 2006, s. 233).

Ayağı altında yeri görməyən
Başının üstündə Allahı görməz
(Zəlimxan Yaqub, 2006, s. 258).

Sabir Rüstəmxanlının dilindəki bir sıra misralar aforistik səciyyəsi ilə seçilir. Bu mənada aşağıdakı örnəklər xarakterikdir:

Yurdun azadlığı sözdən başlanır,
Ürəkdən başlanır, gözdən başlanır.

Söz ki ucuzlaşıb dəyərdən düşür,
Elə bil bir igid yəhərdən düşür
(Rüstəmxanlı, 2004, s. 227).

Bəhmən Vətənoğlunun dilində də nəsihətamiz xarakterə malik örnəklər geniş yer alır. Onun bütün əsərlərində dilçilik baxımından çox sayda yararlı faktlar əldə etmək mümkündür. "Başa çəkərmiş" rədifli qoşma fəlsəfi dili ilə həyat gerçəkliklərini ortaya qoyur. Burada bədii dilin mayasında dayanan söz və məna ahəngi şeirin dilini təbiiləşdirir:

Aman Allah, nə gec başa düşmüşəm,
İnsanları insan başa çəkərmiş.
İndi bildim, arifləri ariflər,
Nadanları nadan başa çəkərmiş
(Şair Bəhmən, 2017, s. 509).

Əsərdən bəlli olur ki, şeirin məzmununda sözlərin leksik məna qruplarının çoxluğu hikmətli sözlərə əlverişli poetik ortam yaradır. Fikrin düzgün, sərbəst anlaşılmasına və yetərli dərəcədə ifadəsinə imkan yaradan sözlər müəllifin dilimizə münasibətini də təyin edə bilir:

Yaman gələr yaxşılara tən, demə,
Bu həyatı dərk etmişəm mən, demə.
Buynuzlaya-buynuzlaya, sən demə,
Heyvanları heyvan başa çəkərmiş
(Şair Bəhmən, 2017, s. 509).

Şairlər sözlərin bədii həyatını canlandıraraq, həm də oxucularına bu həyatın davam edəcəyini, bitib tükənməyəcəyini inandırırlar. Çünki poetik dil elə bir qüdrətə malikdir ki, illərlə yaşasa da, daim yenilənsə də, hər zaman yeni məna və fikirlərlə öz aktuallığını qoruyur. Onu canlandırdıqca sirli dünyasına daha böyük maraq oyanır. Sənətkar qələmində nitqin axarına düşən sözlər hər dəfə yeni cazibə qazanır və ondan doymaq olmur. Onlardan gələn hikmət düşüncələrə sövq edir, bəzən atalar sözləri kimi tərbiyəedici gücü ilə insanlıq duyğularını gücləndirir. Bu baxımdan, Kəmalə Ağayevanın aforizm səviyyəsində deyilmiş sözləri diqqəti cəlb edir:

Ləyaqət səddini adlayan hisslər
Cinayət törədər, xəcalət elər
(Ağayeva, 1982, s. 139).

Ülfət dünyasında ilqar yaranır,
Dağ uca olanda vüqar yaranır
(Ağayeva, 1967, s. 3).

Gecə ötməyincə gündüz gələrmi?
(Ağayeva, 1967, s. 25).

Dünya zəhmət ilə cənnət deyilmi?
(Ağayeva, 1982, s. 71).

Dilimizdəki atalar sözlərinin müəllifləri məlum deyil, lakin hikmətli ifadələrin əksəriyyəti müəlliflidir. Bu hikmətli fikirlər atalar sözlərinin təsirini davam etdirir. Atalar sözü xalqımızın mənəvi mədəniyyətini, söz ifadə etmək qabiliyyətini, aydın düşünmə tərzini qoruyan etibarlı mənbələrdəndir. Onların həm də düşündürücü və tərbiyəvi rolu vardır. Xanəli Kərimlinin dilindəki hikmətli ifadələr də oxucunu düşündürür, tərbiyə edir, insanın iç dünyasında dərin izlər buraxır:

Hər ulayan Boz Qurd olmur!
(Kərimli, 2004, s. 25).

Səbri qeyrətindən uca millətin
Torpağı bölünər, ruhu aşınar
(Kərimli, 2004, s. 40).

Yediyi çörəyə dönük çıxan kəs
Haqqa can atsa da, haqqa yetişməz
(Kərimli, 2004, s. 72).

Maraqlıdır ki, şair kimi tanınan Xanəli Kərimli kiçik həcmli nəsr əsərləri də yazmışdır. Onlar şairin dərin düşüncələrinin ifadəçisi kimi diqqəti cəlb edir.

Həmin nəsr örnəkləri də hikmətli fikirlərlə zəngindir:

Qiymətləndirmə aqillərin, qeybət etmə nadanların işidir
(Kərimli, 2004, s. 134).

Vicdanı olmayanın mənəvi ağrısı da olmur
(Kərimli, 2004, s. 135).

Belə fikirlər ağılın məhsuludur; onların ağıldan dilə, dildən qələmə axmasında ürəyin böyük rolu vardır. Şairlərin yazdıqları təkcə onların bacarıq və qabiliyyəti ilə bağlı deyil, həm də onların duyumunun, dərkinin, böyük ürəyinin diqtəsidir.

Qafar Qəribin dilindəki bir sıra aforistik məzmunlu fikirlər barədə aşağıdakıları qeyd etmək olar:

Dilə bal sürtməklə şirin olmaz dil,
Söz əhli söz qoşar ruhu gözələ
(Qafar Qərib, 2008, s. 13)

Qızıl sevməz qarışığı
(Qafar Qərib, 2008, s. 15).

Bulaq dönüb çay olammaz,
Ulaq dönüb day olammaz,
Bir mərdinə tay olammaz
Bu dünyanın yüz gədəsi
(Qafar Qərib, 2008, s. 31).

Bu cür örnəklərin sayını dəfələrlə artırmaq mümkündür. Bu da onu təsdiq edir ki, xalqımızın söz ustaları həm də tərbiyəedici xüsusiyyətə malikdirlər.

**Nəticə**

Qədim dövrlərdən bu günə qədər Azərbaycan poetik dilində saysız-hesabsız hikmətli ifadələr yaranmışdır. Onlar xalqımızın əxlaqını, mədəniyyətini, söz ifadə etmək bacarığını əks etdirir. Söz, şairlər üçün mənəvi qida olub, həyati əhəmiyyət daşıyır. Onlar üçün sözsüz həyat mövcud deyil. Söz şairlərin ürək dostu, həmdəmidir. Onlar ürəklərindən keçənləri sözlə ifadə edirlər. Hər bir insan öz daxili nitqində və cəmiyyətlə ünsiyyətdə sözlərə müraciət edir. Hikmətli sözlər, şairlərin yalnız daxili düşüncələrinin bir hissəsi deyil, eyni zamanda insanlara verdiyi ismarışdır.

## Ədəbiyyat


1. Ağayeva, K. (1962). *Baharın sözü*. “Uşaq və gənclər ədəbiyyatı” nəşriyyatı.
2. Ağayeva, K. (1982). *Daş piyalə*. Yazıçı.
3. Ağayeva, K. (1967). *Gül yarpağı*. Gənclik.
4. Arif, H. (2004). *Seçilmiş əsərləri*. Şərq-Qərb.
5. Cabbarzadə, Z. (2005). *Seçilmiş əsərləri*. Avrasiya press.
6. Dilbazi, M. (2004). *Seçilmiş əsərləri*. “Lider” Nəşriyyat.
7. Kərimli, X. (2004). *Bu da bir nağıldı...* Nurlan.
8. *Kitabi-Dədə Qorqud*. (2004). “Öndər” Nəşriyyat.
9. Kürçaylı, Ə. (2004). *Seçilmiş əsərləri*. Şərq-Qərb.
10. Qafar Qərib. (2008). *Göydən üç alma düşdü*. “ADPU” Nəşriyyatı.
11. Qurbani. (2006). *Əsərləri*. Şərq-Qərb.
12. Molla Cümə. (2006). *Əsərləri*. Şərq-Qərb.
13. Nəbi Xəzri. (2004). *Seçilmiş əsərləri*. I, II cild. “Lider” Nəşriyyat.
14. Nəsimi. (2017). *Seçilmiş əsərləri*. 2 clddə. “Lider” Nəşriyyat.
15. Rüstəmxanlı, R. (2004). *Seçilmiş əsərləri*. Şərq-Qərb.
16. Səfərli, İ. (2005). *Seçilmiş əsərləri*. “Lider” Nəşriyyat.
17. Şair Bəhmən. (2017). *Aşıq ədəbiyyatı antologiyası*. Xalq Bank.
18. Zəlimxan Yaqub. (2006). *Seçilmiş əsərləri*. Şərq-Qərb.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 35–42
https://doi.org/10.48445/c0465-1042-0831-l

# İbtidai siniflərdə nitq hissələri əsasında qrammatik məfhumların yaradılmasının əsas istiqamətləri

***Könül Məmmədova*** [1]

**XÜLASƏ**
*Məqalədə ibtidai siniflərdə nitq hissələri əsasında qrammatik məfhumların yaradılmasının əsas istiqamətlərindən bəhs olunur. Nitq hissələri bir neçə il ərzində tədris olunaraq tədricən mənimsənilir. Qrammatik məfhumların möhkəm mənimsənilməsi üçün onu əvvəllər öyrənilmiş məfhumla müqayisə etmək lazımdır. Müxtəlif qrammatik kateqoriyaları bildirən sözlərin müqayisəsi xüsusilə faydalıdır. Şagirdlər Azərbaycan dili dərslərində tərif və qaydaları öyrənməklə* bu qaydalara *müvafiq nümunələr seçir, sözlərin məna və qrammatik təhlilini aparır və nəticə çıxarırlar. Bununla bərabər, üslubi xarakterli tapşırıqları yerinə yetirir, söz yaradıcılığı və eyniköklü sözlər seçmək üzrə iş aparır, müqayisəli sxemlər, cədvəllər çəkir, ifadə və inşa yazırlar. Bütün bunlar şagirdlərin düşüncə qabiliyyətini zənginləşdirməklə yanaşı, onların nitq bacarıqlarını da inkişaf etdirir.*

**AÇAR SÖZLƏR**
*nitq hissələri, qrammatik məfhumlar, tərif və qaydalar, dildə qrammatik hadisələr*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 14.03.2025
Qəbul edilib: 05.05.2025

[1] Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. https://orcid.org/0000-0001-8664-4912 | könül.1970@mail.ru

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 35–42
https://doi.org/10.48445/c0465-1042-0831-l

# The Main Directions of Creating Grammatical Concepts Based on Parts of Speech in Primary Classes

***Konul Mammadova*** [1]

**ABSTRACT**
*The article talks about the main directions of creating grammatical concepts based on parts of speech in primary classes. Parts of speech are taught over several years and gradually mastered. In order for a grammatical concept to be firmly grasped, it should be compared with a previously learned concept. A comparison of words denoting different grammatical categories is particularly useful. By studying definitions and rules in Azerbaijani language classes, students choose examples corresponding to these rules, analyze the meaning and grammar of words and draw conclusions. At the same time, they perform tasks of a stylistic nature, work on word creation and choosing words of the same root, draw comparative schemes and tables, write expressions and essays. All this not only enriches students' thinking ability, but also develops their speaking skills.*

**KEYWORDS**
*parts of speech, grammatical concepts, definition and rules, grammatical events in the language*

**ARTICLE HISTORY**
Received: 14.03.2025
Accepted: 05.05.2025

---

[1] Doctor of Philosophy in Pedagogy, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. https://orcid.org/0000-0001-8664-4912 | könül.1970@mail.ru

 

## Giriş

Məfhum − elə təfəkkür formasıdır ki, onun vasitəsilə predmet və hadisələrin ümumi və mühüm əlamətləri beynimizdə əks olunur. Bu isə təfəkkür forması kimi məfhumların universallığını ifadə edir. Bu universallıq məfhumun gerçəkliyin keyfiyyətcə müxtəlifliyini və vəhdətini əks etdirmək xüsusiyyətindən irəli gəlir. Məsələn, «meyvə» məfhumu dedikdə, hisslərlə qavradığımız konkret armud, şaftalı, gilas və s.-dən fərqli olaraq onların hamısına xas olan ümumi və mühüm əlamətləri düşünürük, yaxud «planet» məfhumu dedikdə, konkret Yeri, Marsı, Veneranı və başqalarını deyil, onların hamısına xas olan öz 8 oxu və Günəş ətrafında fırlanmaq, kürə formasında olmaq və digər ümumi və mühüm əlamətləri təfəkkürümüzdə əks etdiririk.

Qrammatik biliklərin mənimsənilməsi üçün hər bir yeni məfhumu əvvəllər öyrənilənlərlə müqayisə etmək və əlaqələndirmək vacibdir. Müxtəlif qrammatik kateqoriyaları ifadə edən sözlərin müqayisəsi öyrənmə prosesini asanlaşdırır.

Şagirdlər Azərbaycan dili dərslərində tərif və qaydaları öyrənir, bu qaydalara müvafiq misallar seçir, sözlərin məna və qrammatik təhlilini aparır və nəticə çıxarırlar. Həmçinin üslubi xarakterli tapşırıqları yerinə yetirir, söz yaradıcılığı və eyniköklü sözlər seçmək üzrə iş aparır, müqayisəli sxem və cədvəllər çəkir, ifadə və inşa yazırlar. Bütün bunlar şagirdlərin bilik bazasını zənginləşdirir və nitq bacarıqlarını inkişaf etdirir (Oxu təlimi (müəllim üçün vəsait).

Nitq hissələri şagirdlərə bir neçə tədris ili ərzində tədricən mənimsədilir. I sinifdən fərqli olaraq, II sinifdə şagirdlər "nitq hissəsi" anlayışına daxil olan, səslənmə etibarilə bənzər, mənaca fərqli sözləri (çal – çağır; göz – gözəl) eyniköklü hesab edirlər. Ona görə də doğru anlayışın yaranması üçün faktları düzgün seçib öyrətmək lazımdır. Məsələn, sifət anlayışı onun iki mühüm əlaməti əsasında yaranır:

1. Nəyə deyilir?
2. Hansı suallara cavab verir?

## Metodlar

Məqalədə empirik metodlardan müşahidə, müsahibə, nəzəri-təhlil, empirik-nəzəri metodlardan təhlil və tərkib, induksiya, deduksiya, mücərrədləşdirmə və konkretləşdirmədən istifadə olunmuşdur. Belə ki, qoyulmuş problemlə bağlı müəllimlərin dərs prosesində şagirdlər üzərində apardığı müşahidə, müsahibə və nəzəri təhlilləri ümumiləşdirilərək araşdırma aparılmışdır. Dərslərdə induksiya,deduksiya dərs tiplərindən və metodlardan geniş istifadə olunmuşdur.

*Deduksiya* mühakimə prosesində ümumi müddəalardan xüsusi nəticə çıxarmaq, hər hansı bir ümumi fikirdən məntiqi yola çıxmaq, prinsip, yaxud təklif ortaya qoymaq üçün istifadə olunan metoddur.

*İnduksiya* ayrı-ayrı faktlardan və ya xüsusi təsadüflərdən ümumi nəticələri çıxarmaqla mühakimə yürütmək üsuludur. İnduksiyanın özünəməxsusluğu onunla müəyyən olunur ki, o, müşahidə, təcrübə və deduksiya ilə sıx qarşılıqlı əlaqədədir.

Beləliklə, induksiya elə bir əqli nəticəyə deyilir ki, burada hər hansı bir sinfə daxil olan hadisələrdə müəyyən əlamətlərin təkrar olunmasına əsaslanaraq, onların həmin sinfin bütün üzvlərinə aid olduğu haqqında nəticə çıxarılır (Məmmədova, 2022, s. 103). Yəni burada təfəkkür prosesi azdan çoxa, növdən cinsə, təkcə və xüsusilərdən daha çox ümumiyə doğru gedir.

**Nəticələr**

Uşaqlarda sifət haqqında düzgün anlayışın yaranması üçün təhlil edilib ümumiləşdiriləcək materiala əşyanın müxtəlif əlamətlərini (rəngini, ölçüsünü, hansı materialdan hazırlanmasını, dadını və s.) ifadə edən sifətlər verilmişdir. Məsələn, alma – ağ, sarı, yaşıl, qırmızı (rəng); yumru, uzunsov, yastı (forma); böyük, kiçik (ölçü); turş, şirin, kəmşirin (dad); ətirli (iy) və s. Nəticələr, BİBÖ təlim üsulu vasitəsilə şagirdlərə cədvəl üzərində müstəqil olaraq yaradıcı iş formasında təqdim olunmuşdur.

**BİBÖ**

| Bilirəm | İstəyirəm bilim | Öyrəndim |
|---|---|---|
| Əsas nitq hissəsidir, əşyanın əlamətini bildirir, *necə? nə cür hansı?* suallarına cavab verir, quruluşca üç növü var, müqayisə dərəcələri var. | Düzəltmə sifətlər hansılardır və necə əmələ gəlir? Mürəkkəb sifətlərə hansılar aiddir? | İsimdən düzələn sifətlər: -lı$^4$; -sız$^4$; -cıl$^4$; -ı$^4$; -lıq$^4$ və s. Feildən düzələn sifətlər: -ağan,-əyən,-qan (-kən); -qım (-kin, -qun, -kün); -unc$^2$; -kən, -kin, -kün. Mürəkkəb sifətlər iki sadə sözün birləşməsi ilə düzəlir. Məsələn: qaraqaş, uzunsaç, diribaş. |

**Müzakirə**

İlk ümumiləşdirmə zamanı şagirdlər müəyyən edirlər ki, bütün bu xüsusiyyətlər əşyanın əlamətini bildirir və *necə*? sualına cavab verir. Sonralar şagirdlər ardıcıl olaraq sifətin digər mühüm əlamətləri ilə də tanış olurlar.

Ümumiyyətlə, qrammatik məfhumların yaranması birdən-birə deyil, tədricən baş verir. Şagirdlər ayrı-ayrı mühüm əlamətləri ardıcıllıqla mənimsəyirlər. Müəllim hər bir qrammatik hadisəni onun müxtəlif əlamətlərinə görə dərk etməyi öyrətməlidir ki, şagirdlərdə biliklər sistemi tam olaraq yaransın və şagirdlər onlardan istifadə edə bilsinlər (Keskin, Ömeroğlu, 2015, s. 80-95).

Dildə qrammatik hadisələr bir-biri ilə bağlı olub, biri digərinin başa düşülməsinə kömək göstərir. Ona görə də qrammatik anlayışların yaranması şagirdlərdən qazanılmış ilkin biliklərə istinad etməyi tələb edir. Məsələn, isimlərin hallanması haqqında məfhumun yaranması üçün ahəng qanununa istinad etmək lazım gəlir (Məmmədova, 2022, s. 102-105).

Şagirdlərə əşya haqqında anlayış verildikdən sonra, söhbət feildən gedərkən, oxşar məna daşıyan və qarışdırılan sözlər – məsələn, “su”, “sulayır” və “sulu” – qarşı-qarşıya qoyulur. Sonra müəllim söz assosiasiyası vasitəsilə bu sözlərin hər birini ayrı-ayrılıqda şaxələndirir.




İsmin hallanması, feilin zamana və şəxsə görə dəyişməsi də müqayisə yolu ilə izah edilir. Şagirdlərdə sözlərarası assosiasiya yarananda onlar öyrənilən nitq hissəsinin bütün əlamətlərini dərk edir, həmin nitq hissəsinə dair əməliyyat aparır və məşq edirlər. Yalnız həmin vaxt şagirdlərdə bu və ya digər nitq hissəsi haqqında tam

anlayış formalaşır. Qrammatik məfhumların yaranması dərsliklərdə verilmiş təriflərin qoyuluşundan da çox asılıdır. İbtidai siniflər üçün dil dərsliklərindəki təriflər bu və ya digər qrammatik məfhumu tamamilə xarakterizə etmir. Belə ki, nitq hissələrinin tərifi, adətən, iki əlaməti əhatə edir: nəyə deyilir və hansı suallara cavab verir? Dərsliklərdə onun dəyişməsi, cümlənin hansı üzvü rolunda olması və s. haqqında söhbət getmir.

Bəzi qrammatik məfhumlar isə (məsələn, feilin zamanları və s.) tamamilə tərifsiz, praktik yolla mənimsədilir. Qrammatik tərifdə məfhumun məzmunu, tərkibi qısaca ifadə edilir, ümumiləşdirilir. Ona görə tərifi dəqiq və şüurlu əzbərləmək lazımdır. Tərifin əzbərlənməsi fikri dəqiq ifadə etməyi, bilikləri sistemə salmağı və nitqdə ondan istifadə etməyi öyrədir (Cəfərova, 2015, s. 343). Qrammatik məfhumu yalnız o zaman mənimsənilmiş hesab etmək olar ki, şagirdlər qazandıqları biliyi nitqlərində tətbiq etməyi bacarsınlar. Şagirdlər mənimsədikləri qrammatik hadisəni konkretləşdirməli, ayrı-ayrı hallara aid etməli, müvafiq nümunələr tapmalı, onların düzgünlüyünü sübut etməli, ifadə və inşa yazarkən həmin biliklərdən istifadə etməyi bacarmalıdırlar (Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı, 2013).

Şagirdlər Azərbaycan dili dərslərində tərif və qaydaları öyrənir, bu qaydalara aid nümunələr seçir, müstəqil misallar söyləyir, sözlərin məna və qrammatik təhlilini aparır və nəticə çıxarırlar (Həbibova, 2016, s. 128).

Dərsdə yerinə yetirilən bu cür fəaliyyətlər şagirdlərdən böyük fəallıq tələb edir. Lakin bu hal təlim prosesində müəllimin fəaliyyətini əsla heçə endirmir (Veysova, 2007, s. 27). Dərsdə bütün bu mürəkkəb prosesə rəhbərlik etmək, şagirdlərin fəaliyyətini sistemli və məqsədyönlü şəkildə təşkil etmək üçün müəllim səmərəli üsul və yollardan istifadə etməyi bacarmalıdır.

**Nəticə**

1. Obyektiv gerçəkliyin dərk olunmasında istifadə olunan təfəkkür formalarından biri də məfhumlardır. Məfhum cism və hadisələrin ən ümumi, mühüm, zəruri xassə və əlamətlərini, cism və hadisələr arasındakı əlaqə və münasibətləri beynimizdə əks etdirən fikirdir, təfəkkür formasıdır. Hər bir mücərrəd təfəkkür məfhum formasında həyata keçirilir. Məfhum insan təfəkkürünə xasdır, buna görə də məfhumların köməkliyi ilə hadisələrin daxili təbiətini, onların məzmununu açmaqla gerçəklik haqqında yeni biliklərə yiyələnirik. Məfhum elə bir hüceyrədir ki, bütün fikir aktı onun üzərində təşəkkül tapır. Elmi məfhumlar nə qədər

doğru və mükəmməl olarsa, gerçəkliyi daha dərindən əks etdirər.

2. Biz gerçəkliyin hərəkət və inkişafını məfhumlar, hökmlər, kateqoriyalar və qanunlar vasitəsilə beynimizdə əks etdirir, öyrənirik. Bu mənada məfhumlar hərəkətsiz deyildir, onlar daim hərəkət edir, bir-birinə keçir, canlanır, onlar olmadan canlı həyatı anlamaq çətindir.

3. Dialektik məntiq məfhumun, o cümlədən qrammatik məfhumun hərəkət və elastikliyinin mənbəyini, gerçəkliyin çoxcəhətliliyində, onun inkişafında aşkara çıxarır. Məfhumlar insanların maddi istehsaldakı fəaliyyəti nəticəsində formalaşır, cilalanır, hadisə və prosesləri düzgün əks etdirmək səviyyəsinə qədər yüksəlir.

4. Məfhumlar yüksək təşəkkül tapmış insan beyninin ali məhsuludur. Hər bir məfhumun inkişaf prosesi iki istiqamətdə gedir:

– elmin, texnikanın və mədəniyyətin inkişafı nəticəsində yaranan məfhumlar dürüstləşdirilir və abstraksiya səviyyəsinə qaldırılır;

– köhnə məfhumlar dəyişdirilir, saf-çürük edilir, bununla da gerçəkliyin dəqiq, dolğun mənzərəsini əks etdirən yeni məfhumlar sistemi yaranır.

**Ədəbiyyat**


1. *Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı*. (2013, 9 aprel). President.az. http://www.president.az/articles/7744
2. Cəfərova, N. (2016). *İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi*. I hissə. ADPU-nun mətbəəsi.
3. Cəfərova, N. B. (2015). *İbtidai siniflərdə morfologiyanın tədrisinin nəzəri və praktik əsasları: ...doktorluq dis*.
4. Həbibova, N. (2016). *İbtidai siniflər üçün terminlər lüğəti.* Altun Kitab.
5. Keskin, F., Ömeroğlu, E., & Okur, A. (2015). 0-6 yaş arasındaki çocuklara sözcük öğretimi ile ilgili çalışmaların incelenmesi. *Ana Dili Eğitimi Dergisi*, 3(1), 80-95.
6. Qurbanov, V. T., Abbasova, S. İ. (2017). Tədris prosesində inteqrasiya imkanlarına dair. *Məktəbəqədər və ibtidai təhsil*, 3, 13-16.
7. Məmmədova, K. Ə. (2022, 27 fevral). *İbtidai siniflərdə nitq inkişafı üzrə işin başlıca istiqamətləri.* Beynəlxalq konfrans materialları. Qars-Türkiyə, s. 102–105.

8. *Oxu təlimi* (müəllim üçün vəsait). http://www.tipii.edu.az/noduploads/document/oxu-talimi-muallimlar ucun-vasait.pdf
9. *Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları).* (2020). https://edu.gov.az/upload/file/tehsil-pillesinin-dovlet-strandartlari-ve proqramlari.pdf
10. Veysova, Z. (2007). *Fəal / intetaktiv təlim* (müəllimlər üçün vəsait).

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 43–56
https://doi.org/10.48445/c9770-3103-8913-h

# İbtidai siniflərdə dil qaydalarının öyrədilməsində yeni təlim texnologiyalarından istifadə

***Fəridə Səfərəliyeva*** [1]

**XÜLASƏ**
*Dilçiliyin ən zəngin və nisbətən mürəkkəb bölməsi qrammatikadır. Məlumdur ki, qrammatika sözlərin dəyişməsi və onların cümlədə birləşməsi qaydalarının məcmusudur. Dilçiliyin bu sahəsi bizə nitqimizi düzgün qurmaq, fikrimizi səlis və aydın şəkildə ifadə edə bilmək, sözləri cümlələrdə işlətmək, bir-biri ilə əlaqələndirmək və bu kimi qayda-qanunları öyrədir. Deməli, bu gün ibtidai sinif müəllimi şagirdlərə dil qaydalarını səthi deyil, dərindən öyrətməli və verilən biliyi möhkəmləndirmək üçün bir sıra metodlardan istifadə etməlidirlər. Məqalənin praktik əhəmiyyəti dil qaydalarının öyrədilməsi zamanı fəal təlimdə problemli vəziyyətin yaradılması, eyni zamanda tənqidi təfəkkürü, təhliletmə və ümumiləşdirmə vərdişlərinin inkişaf etdirilməsi yollarını təhlilə cəlb etməkdir. Müasir dərs prosesində müəllim uşaqlarda yaradıcı təxəyyülü inkişaf etdirməyə və idraki müstəqilliyə xidmət göstərən problemli suallara, düşündürücü məsələlərə xüsusi yer verməlidir. Belə dərslər şagirdlərdə müəyyən bacarıq və vərdişlər formalaşdırır. Məqalənin elmi yeniliyi müasir Azərbaycan ədəbi dil normalarının (fonetik, orfoqrafik, orfoepik, leksik, semantik, qrammatik, üslubi) ibtidai siniflərdə praktik yolla mənimsənilməsinin şagirdlərin kamil nitqə yiyələnməsini təmin etməsidir.*

**AÇAR SÖZLƏR**
*dil qaydaları, ibtidai sinif, fəal-interaktiv təlim*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 07.03.2025
Qəbul edilib: 10.05.2025

---

[1] Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. https://orcid.org/0000-0003-1161-5759 | f.safaraliyeva@mail.ru

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 43–56
https://doi.org/10.48445/c9770-3103-8913-h

# The Use of New Learning Technologies in Teaching Language Rules in Elementary Grades

***Farida Safaraliyeva*** [1]

**ABSTRACT**
*The richest and relatively complex section of linguistics is grammar. It is known that grammar is a set of rules for changing words and their combination in a sentence. This branch of linguistics teaches us how to correctly build our speech, be able to express our thoughts fluently and clearly, use words in a sentence, correlate them with each other and the like. So, today a primary school teacher should teach students not superficially, but deeply, the rules of the language and use a number of methods to consolidate the knowledge given. The practical significance of the article is the creation of a problem situation in active training during the teaching of language rules, as well as the involvement in the analysis of ways to develop critical thinking, skills of analysis and generalization. In the process of modern teaching, the teacher should give a special place to problematic questions, thought-provoking issues that serve to develop creative imagination in children and cognitive independence. Such classes form certain skills and habits in students. The scientific novelty of the article is that the practical mastery of modern Azerbaijani literary language norms (phonetic, orthographic, orthoepic, lexical, semantic, grammatical, stylistic) in primary grades ensures that students acquire perfect speech.*

**KEYWORDS**
*language rules, elementary school, active-interactive learning*

**ARTICLE HISTORY**
Received: 07.03.2025
Accepted: 10.05.2025

---

[1] Doctor of Philosophy in Pedagogy, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. https://orcid.org/0000-0003-1161-5759 | f.safaraliyeva@mail.ru

 

**Giriş**

Ümumtəhsil məktəblərinin ibtidai təhsil səviyyəsindəki fənlər içərisində ana dili özünəməxsus yer tutur. O, ilk növbədə, şagirdlərin nitq inkişafını təmin edən, təfəkkürünün formalaşmasında həlledici rol oynayan bir fənn kimi xüsusi əhəmiyyətə malikdir. Çünki ana dili digər fənlərin tədrisində bir vasitə rolunu oynamaqla yanaşı, onların daha səmərəli tədris olunmasına dəstək verən əsas amil kimi çıxış edir və nitq inkişafı imkanlarını genişləndirmiş olur. Bu gün Azərbaycan dilinin praktik tədrisi missiyası, onun yalnız bir fənn olaraq öyrədilməsi zərurətini yaratmır, eyni zamanda daha səmərəli təşkili imkanlarını genişləndirmək üçün əlavə araşdırmaların aparılmasını da tələb edir.

*Tədqiqatın aktuallığı*

İbtidai siniflərdə Azərbaycan dili təliminin məzmununu müəyyənləşdirmək, öyrənilən bilik, bacarıq və vərdişlərin formalaşdırılmasının metodik sistemini hazırlamaq, şagirdlərdə nitq mədəniyyətinin inkişaf etdirilməsinin optimal yollarını göstərməkdən ibarətdir. İbtidai məktəbdə heç bir fənni bir-birindən ayrı şəkildə tədris etmək mümkün deyil. Azərbaycan dilində nitq inkişafına üstünlük verildiyinə görə oxu ilə bu fənn arasında inteqrasiyaya yol açılır. Dil dərslərində isə yaradılan inteqrasiya prosesində şagirdlərin söz ehtiyatı zənginləşir, həmçinin onlar fikirlərini rabitəli şəkildə ifadə edirlər. Azərbaycan dilçiliyinin ən əsas bölməsi sayılan qrammatika, özündə morfologiya və sintaksisi birləşdirir. Morfologiyada elə bir mövzu yoxdur ki, onun sintaksislə əlaqəsi olmasın. Sintaksisdə cümlənin məqsəd və intonasiyaya görə növləri haqqında nəzəri məlumat verərkən sual əvəzlikləri, sual ədatları, feilin əmr və digər şəkilləri, eləcə də nidalar haqqında biliklər təkrarlanıb möhkəmləndirilir. Həmçinin fonetika bölməsi ilə inteqrasiya qurulur, intonasiyanın mahiyyəti bir daha açılır.

Bir məqamı vurğulayaq ki, dil iki nəhəngin — lüğət tərkibi və qrammatik quruluşun üzərində dayanır. Dilçiliyin maraqlı bölmələrindən olan leksikologiyada dilin lüğət tərkibi öyrədilir. Leksikologiyanın əsas predmeti sözdür. Məlumdur ki, fikrin dəqiq ifadəsi üçün lüğət ehtiyatının zənginliyi böyük əhəmiyyət kəsb edir. Sözlərin mətn daxilindəki yerini və semantikasını dərk etmədən, ona həssas münasibət aşılamaq qeyri-mümkündür. Bunu ilk növbədə ibtidai sinif müəllimləri bilməli və tətbiq etməlidirlər. Leksikologiyada sözün lüğəvi mənası, onun mahiyyəti, omonimliyi, antonimliyi, sinonimliyi, sözün mənşəyi, işlənmə dairəsi öyrənilir. Söz və sintaksisdə öyrənilən söz birləşmələri dilin nominativ vahidləri sahəsinə daxildir.

Söz, cümlә üçün olduğu kimi, söz birlәşmәlәri üçün dә әsas materialdır. Әgәr birlәşmәni әmәlә gәtirәn sözlәrin mәnası aydın deyilsә, o zaman söz birlәşmәsinin dә mәnası aydın olmayacaqdır. Dilçi alim R. Hümmәtova yazır ki, "leksikologiyada qazanılan biliklәri sintaksisdә asanlıqla müqayisәli şәkildә tәtbiq etmәk, inkişaf etdirmәk mümkündür vә vacibdir" (Hümmәtova, 2023, s. 25). Bu gün pedaqoji tәcrübәdә olarkәn müәllimlәrin әksәriyyәtinin dәrslәrini әnәnәvi tәlimlә keçirdiyinin şahidi oluruq. İstәr dil qaydalarını, istәrsә dә oxu ilә bağlı mövzuları tәdris edәrkәn müәllim fәal/interaktiv tәlim texnologiyalarından istifadә etmәli, bir sözlә, onun planlaşdırma bacarığı olmalıdır.

**Metodlar**

Bilik yalnız yadda saxlamaq üçün şagirdlәrә ötürülmüş hazır informasiya deyildir. Müәllim tәlim prosesi zamanı şagirdlәrә bәlәdçilik etmәli, onların "tәdqiqat" aparmaları, biliklәri dәrk etmәlәri üçün şәrait yaratmalıdır. Müәllim Azәrbaycan dili tәdrisini şagirdlәri idrak fәallığına yönәltmә, düşünmә vә dәrketmә yolu ilә hәyata keçirmәli vә ünsiyyәt yaratmağa çalışmalıdır. Peşәkar müәllim bu mәqsәdә yalnız hәr birfәnnin tәdrisindә fәal/interaktiv tәlim metodlarından istifadә etmәklә nail ola bilәr.

Bilirik ki, tәdqiqatlar müxtәlif metodların kömәyi ilә aparılır. Tәdqiqatın metodları onun metodologiyası ilә sıx bağlıdır. Azәrbaycan dilinin tәdrisi metodikası elminin tәdqiqat metodları dedikdә, müәyyәn elmi problemi hәll etmәk üçün istifadә olunan yol vә vasitәlәrin mәcmusu başa düşülür. Müsahibә metodu – müәyyәn pedaqoji hadisәnin mahiyyәtini, sәbәblәrini, başvermә şәraitini aşkara çıxarmaq mәqsәdi ilә aparılan sual-cavab metodudur. Mәqalәdә bu metoddan istifadә edilmişdir. Aydındır ki, müasir dәrs müәllimdәn dәrsә ciddi hazırlıq tәlәb edir. Buna görә dә müәllim hansı priyomlardan necә vә nә zaman istifadә edәcәyini әvvәlcәdәn müәyyәnlәşdirmәli, sinifdә çatdıracağı informasiyanın strukturunu öncәdәn düşünmәli, mövzuya dair fakt vә hadisәlәri әsas mәsәlәnin hәllinә yönәltmәyi bacarmalı, dövrün mühüm ictimai-siyasi hadisәlәrindәn xәbәrdar olmalıdır. Müasir tәlimin әsas vәzifәsi demokratik ruhlu, müstәqil düşüncәli, yüksәk bilik vә bacarıqlara yiyәlәnmiş gәnc nәsil tәrbiyә etmәkdir. Bunun üçün müәllim tәdris prosesindә dil qaydalarını öyrәdәrkәn yeni tәlim texnologiyalarından, hәmçinin işçi vәrәqlәrindәn istifadә etsә, daha mәqsәdәuyğun olar.

İbtidai siniflәrdә şagirdlәrә Azәrbaycan dilindәn nәlәri öyrәtmәk lazımdır? Bu sualın cavabı, ilk növbәdә, dilçilik vә onun şöbәlәri üzrә qazanılmış bilik әsasında

müəyyənləşdirilə bilər. Buna görə də dilçilik və onun şöbələri dil tədrisi metodikası elminin linqvistik əsaslarını təşkil edir. Əlbəttə, orta məktəbdə Azərbaycan dili fənninin məzmununu müəyyənləşdirmək üçün təkcə dilçilik və onun şöbələri üzrə dərin biliyə malik olmaq kifayət deyildir. Bunun üçün bir sıra didaktik prinsiplərə, psixoloji amillərə istinad etmək tələb olunur. Bir məqamı unutmaq olmaz ki, Azərbaycan dilinin tədrisi metodikası dilçilik elmi ilə sıx əlaqədardır. Qrammatikanın tədrisi prosesində tez-tez fonetik, morfoloji, sintaktik formalarla qarşılaşarkən dilçiliyin müvafiq sahələrinə – fonetika və qrammatikaya müraciət etməli oluruq, lakin elmi qrammatikanı məktəbə eynilə gətirmək olmaz. Elmi qrammatikanı müasir Azərbaycan dili üzrə aparılan tədqiqatları oxumadan, onlara istinad etmədən ibtidai siniflərdə qrammatik materialı tədris etmək çətindir. Dilçilik elmi metodikaya material verir, metodika şagirdlərin yaş xüsusiyyətlərini nəzərə almaqla onu hazırlayır, rəngarəng tapşırıq və çalışmalarla zənginləşdirir. Hər hansı qrammatik anlayışı kiçikyaşlı şagirdlərə anlaya biləcəkləri şəkildə, həm də elmi cəhətdən dəqiq aydınlaşdırmaq məqsədilə müəllim daim araşdırmalar aparmalıdır. Buna ehtiyac duymayan, yalnız dərslikdə verilənləri oxumaqla kifayətlənən müəllimlər, şübhəsiz, lazımi nəticə əldə edə bilməzlər.

II sinif üçün yazılmış Azərbaycan dili dərsliyində “İsgəndər” mətni verilmişdir. Şagirdlərin söz ehtiyatını genişləndirmək üçün mətnin aşağısında onlara söz boğçası təqdim olunur:

*daşı daş üstə qoymamaq, mühasirə, sərkərdə, tabe olmaq, düşərgə, yerlə yeksan etmək* (Nurullayeva və b., 2020, s. 31).

Nitq inkişafı istiqamətlərindən biri, məhz lüğət ehtiyatının zənginləşdirilməsidir. Sözsüz ki, müəllim müsahibə metodundan istifadə edərək sözlərin mənasını şagirdlərdən soruşmalıdır. Çünki şagird “daşı daş üstə qoymamaq”, “yerlə yeksan etmək” kimi birləşmələrin mənalarını anlamaqda çətinlik çəkəcək.

Müəllim üçün metodik vəsaitdə dərsin qısa planına diqqət yetirək.

| | | |
|---|---|---|
| 1. | Mövzuya yönəltmə | Müəllimin sualı ətrafında müzakirə |
| 2. | Oxu | "İsgəndər" mətninin oxusu |
| 3. | Oxuyub-qavrama | Obrazların davranışlarının səbəbinin müəyyənləşdirilməsi; mətndən faktlar gətirməklə obrazın xarakterinin səciyyələndirilməsi |
| 4. | Dinləmə | "Alim və yolçu" mətni |
| 5. | Danışma | Oxuduğu və dinlədiyi mətnlərlə bağlı düşüncələrinin ifadə edilməsi |
| 6. | Söz ehtiyatı | Frazeoloji ifadələrin mənaları ilə uyğunlaşdırılması |
| 7. | Formativ qiymətləndirmə | |

Dərsin qısa planına nəzər saldıqda görürük ki, tədris prosesində həm oxu, dinləyib-anlama və danışma, həm də dil qaydaları əks olunub. Söz ehtiyatında isə müəllim frazeoloji ifadələrin mənalarını izah edir və şagirdlərdən tələb edir ki, həmin sözləri cümlələrdə işlətsinlər. Beləliklə, müəllim ilk olaraq mətni şagirdlərə düzgün, ifadəli, şüurlu olaraq oxutdurur, onun ideyası ilə bağlı suallar verir, daha sonra isə dil qaydalarına toxunur. Bu zaman müəllim təlimin ─ öyrədici, tərbiyəedici və inkişafetdirici məqsədlərini nəzərə alır.

Ümumilikdə şagirdlərin lüğət ehtiyatının zənginliyini yalnız onların nitqindəki sözlərin sayı ilə eyniləşdirmək olmaz. Dərs zamanı həmin sözlərin mənasının şagirdlər tərəfindən qavranılması və onların məna çalarlarından hansı formada istifadə olunması nəzərə alınmalıdır. Qrammatikanın öyrənilməsi, sözsüz ki, şagirdlərin dərketmə qüvvəsinin və məntiqi təfəkkürünün inkişafında xüsusi rol oynayır. Bu zaman şagirdlər təhlil və tərkib kimi əməliyyatlar aparır, dil hadisələri arasındakı uyğunluğu və fərqi seçə bilirlər. Şagird qrammatik məfhum və formaları öyrənməklə sözün mənasını başa düşsə də, onun əsl mənasını, dildəki vəzifəsini və xüsusiyyətlərini anlamır. Əslində, pedaqoji nöqteyi-nəzərdən şüurluluq təlimin əsas

prinsipidir. Ona görə də qrammatik nəzəriyyə şifahi və yazılı nitqlə, orfoqrafiya və orfoepiya ilə əlaqəli tədris olunmalıdır.

Bu gün oxu prosesində ibtidai siniflərdə oxuyan şagirdlərin nitqində müəyyən nöqsanlar olur. Məsələn, reqressiya – oxunmuş hissəni təkrar oxumaq məqsədilə gözlərin geri hərəkətidir. Bu, ən çox yayılmış mütaliə qüsurudur. Bəzən oxucular özləri də hiss etmədən eyni səhifəni yenidən oxuyurlar. Təbii ki, belə geri qayıdaraq yenidən oxu mütaliənin sürətini aşağı salır, çox vaxt isə oxu prosesi yarımçıq qalır. Ləng oxu zamanı həcmi 100 söz olan mətn üçün reqressiyaların sayı 10-15-ə çatır. Aydındır ki, gözlərin bu qədər tez-tez geri hərəkətləri oxunun sürətini azaldır. Əksər şagirdlər həm çətin, həm də asan mətnləri eyni dərəcədə ləng oxuyurlar (Cəfərova, 2023, s. 85).

**Nəticələr**

Azərbaycan dili dərslərində şagirdlərin təfəkkürünü, müstəqilliyini inkişaf etdirmək üçün böyük imkanlar vardır. III sinif Azərbaycan dili dərsliyində fəsillərin strukturuna nəzər salaq:




III sinif Azərbaycan dili dərsliyində “Təbii fəlakətlər” mövzusunda tapmaca verilib. Tapmacanın sonunda qruplarla iş təklif edilir. Şagirdlərdən tələb olunur ki, şəkillərdən və tapmacalardakı əlamətlərdən çıxış edərək təbii fəlakətlər haqqında təqdimat hazırlasınlar (İsmayılov və b., 2022, s. 81).

Təqdimatlar yazılı şəkildə aparılır və bu zaman kiçikyaşlı məktəblilərin həm şifahi, həm də yazılı nitqi formalaşır.

Məsələn, IV sinif Azərbaycan dili dərsliyində cütlərlə və qruplarla iş formasında xeyli sayda tapşırıqlar əks olunmuşdur. Bilirik ki, iş formaları dedikdə, fərdi, cütlərlə, böyük və kiçik quplarla iş nəzərdə tutulur.

***Cütlərlə iş***

Cütlərlə iş zamanı dərs prosesində şagirdlər birgə işləyirlər ki:

- hər hansı bir tapşırığın, qərarın, problemin yerinə yetirilməsində bir-birinə kömək etsinlər;
- öz işlərinin (sinif və ya ev tapşırıqlarının) nəticələri barədə fikir mübadiləsi aparsınlar;
- qarşılıqlı qiymətləndirmə və yoxlama keçirsinlər.

***Qruplarla iş***

Şagirdlər (3–6 nəfər) kiçik qruplarda birləşir və hər hansı problemi həll etmək üçün birgə fəaliyyətə cəlb olunurlar. Qrup şəklində təlim "müəllim-şagird" dialoqundan imtina edilməsini və "müəllim-qrup-şagird" üçlüyünün qarşılıqlı münasibətlərinə keçməyi nəzərdə tutur. Qrup işinin gedişində şagirdlərin birgə fəaliyyəti onlara əməkdaşlıq və müxtəlif problemləri bir yerdə həll etməyi öyrədir. Qrup işi şagirdlərə öz fikrini ifadə etməyə və başqalarını dinləməyə, özünün və digərlərinin işini qiymətləndirməyə imkan yaradır. Bundan başqa, şagirdlər eyni bir məsələ ilə bağlı müxtəlif baxış və yanaşmaların olması barədə təsəvvürə yiyələnirlər.

IV siniflər üçün yazılmış Azərbaycan dili dərsliyi əvvəlki illərdə nəşr olunan dərsliklərdən fərqlənir və aşağıdakı dil qaydaları öz əksini tapmışdır:

**I hissə**

Frazeoloji birləşmələr, N, yoxsa M, qoşa samitlə bitən təkhecalı sözlər, sözlərdə bəzi saitlərin yazılışı, qoşasaitli sözlər, ismin hallanması, sifətin dərəcələri, sitat, zərf, işarə əvəzlikləri, "o" əvəzliyi, ismi və feili birləşmələr, cümlə üzvləri, bədii mətnlərdə təsvir, feili xəbər və ismi xəbər, cümlənin ikinci dərəcəli üzvləri, defis işarəsi.

**II hissə**

Məcaz, sözün leksik və qrammatik mənası, qoşma, mübaliğə nədir? ədat, modal sözlər, antonim sözlərin nitqdə rolu, sözlərin qrammatik mənasının müəyyənləşdirilməsi, lakonik ifadələr, mürəkkəb feillər, omonimlər və çoxmənalı sözlər, şəxsə və zamana görə dəyişməyən feillər, sual əvəzlikləri, terminlər, mürəkkəb adlar və onların yazılışı,bəzi mürəkkəb adlarda dırnaq işarəsindən istifadə.

Diqqət çəkən məqamlardan biri, ümumiləşdirici dərs başlığı altında “Dil qaydaları”, “Nitq hissələri”, “Cümlə və cümlə üzvləri” və “Durğu işarələri” bölmələrinin verilməsidir. Bilirik ki, ümumiləşdirici dərs hər bölmənin sonunda aparılır. Dərsliyin I hissəsinin sonunda izahlı sözlük, II hissəsinin sonunda terminlərin izahı verilmişdir. Müəlliflərin dərsliyin sonunda həm izahlı sözlüyü, həm də terminləri vermələri təqdirəlayiq haldır. Sözsüz ki, dilimizin lüğət tərkibi yeni sözlər hesabına zənginləşir. Bunun üçün ibtidai sinif müəllimi lüğət tərkibinin hansı mənbələrə əsaslandığını bilməlidir. Eyni zamanda müəllim, köhnə sözlərin necə yeni məna kəsb etməsinə, sözyaratma üsullarına, eləcə də alınma mənşəli neologizmlərin hansı yolla mənimsənilməsinə dərindən bələd olmalıdır.

Dərsliyin I hissəsində “Esse nədir?” başlığı altında məlumat verilmişdir: Müəyyən hadisə, fakt və ya problemlə bağlı müəllifin fikirlərini əks etdirən yazı esse adlanır. Esse yazmaqda əsas məqsəd verilmiş mövzuya münasibət bildirməkdir (İsmayılov və b., 2022, s. 18).

*Tapşırıq E*-də şagirdlərə məlumat toplayaraq təqdimat hazırlamaq tapşırılıb:

**I qrup:** Ən hündür dağ

**II qrup:** Ən böyük göl

**III qrup:** Ən uzun çay

**IV qrup:** Ən hündür şəlalə (İsmayılov və b., s. 28).

Dərslik müəllifləri esse haqqında məlumat verərkən eyni başlıqda olan məlumatları bir səhifədə versəydilər, daha məqsədəuyğun olardı. Nümunə olaraq səhifə 29-da “Essedə mühakimə və fakt” başlığı altında qeyd olunur ki, esse yazarkən bəzən müəlliflər oxucuları öz fikirlərinə inandırmağa çalışırlar. Bunun üçün onlar müxtəlif faktlardan – nümunələrdən istifadə edirlər:

1. Tarixi hadisələr və faktlar.
2. Şəxsi həyatından nümunələr.
3. Görkəmli şəxsiyyətlərdən sitatlar və aforizmlər.

*Tapşırıq B*-də cütlərlə iş verilib. “Hər bir yenilik çətinliklə başa gəlir” mövzusunda esse yazın. Bir-birinizin yazısını yoxlayın.

Buradan belə bir fikir formalaşır ki, orfoqrafiya təlimi üzrə hər bir məşğələ şifahi və yazılı nitqin inkişafı və qrammatikanın tədrisi ilə vəhdətdə aparılmalıdır.

Aşağıda təqdim edilən tapşırıq dərslikdə qruplarla iş şəklində verilmişdir.

Aşağıdakı isimləri hallandırıb cümlələrdə işlədin.

**I qrup:** rəssam, kəpənək, meşə

**II qrup:** qonaq, odun, Bakı

**III qrup:** övlad, sünbül, səma

**IV qrup:** gülçü, balıq, dəniz (İsmayılov və b., 2022, s. 39).

Sözsüz ki, peşəkar müəllim bu tapşırıqda ilk olaraq ismin hallanmasına fikir verməlidir. İsmin tədrisində ən mühüm və vaxt tələb edən məsələlərdən biri onun hallanmasının öyrədilməsidir. Şagird "q" və "k" samitinin hansı hallarda və nə səbəbdən "ğ" və "y" ilə əvəz olunmasını bilməli, daha sonra sözləri hallandıraraq cümlədə işlətməlidir. Beləliklə, bu tapşırığı yerinə yetirərkən şagird həm dil qaydalarını mənimsəyir, həm də nitq inkişafı istiqamətlərindən olan ədəbi tələffüz və cümlə qurmaq vərdişlərinə yiyələnir.

Müəllim üçün metodik vəsaitdə ismin hallanması ilə bağlı məqamlara nəzər yetirək.

**Təlim məqsədləri:** Əsas nitq hissələrinin (isim) ümumi leksik-qrammatik xüsusiyyətlərini müəyyənləşdirir.

**Dərsin qısa planı**

1. *Mövzuya yönəltmə*. "Şuşa" sözünün müxtəlif şəkilçilər qəbul edə bilməsinə diqqətin yönəldilməsi.
2. *Dil qaydaları*. İsmin hallanması haqqında məlumatın mənimsədilməsi.
3. *Formativ qiymətləndirmə* (İsmayılov və b., 2023, s. 46).

Müəllim üçün metodik vəsaitdə "Müəllimin nəzərinə" başlığı altında bu məsələlər qeyd olunmuşdur: İlk dərsdə şagirdlərin ismin hallarını fərqləndirə bilməsi və yadda saxlaması çətinlik yarada bilər. Bunun üçün yaxşı olar ki, müəllim hal adlarının mənasını da izah etsin. Məsələn, "Bu Kərimin dəftəridir" cümləsində "Kərim" sözünə əlavə olunan şəkilçi yiyəlik, sahiblik məzmunu yaratdığına görə yiyəlik hal adlandırılır. Digər halları da bu qayda ilə izah etmək mümkündür.

Ümumiyyətlə, interaktiv təlim metod və üsullarının (qruplar, cütlər, rollar, əqli hücum, nəticə və s.) tətbiqi tədris prosesini xeyli intensivləşdirir, onu hər bir şagird üçün maraqlı edir, dərsdə fəallığın maksimum artmasına zəmin yaradır, bununla da təlimin inkişafetdirici aspektini xeyli dərəcədə gücləndirir.

R. Hümmətova haqlı olaraq qeyd edir ki, "dilimizdəki nitq hissələrinin hər birinin özünəməxsus müəyyən xüsusiyyətləri vardır. Onların təsnifində leksik, morfoloji və sintaktik prinsip əsas götürülür" (Hümmətova, 2013, s. 31).

## Müzakirə

Əvvəlki ibtidai siniflər üçün yazılmış dərsliklərdə qruplarla, cütlərlə iş tipli tapşırıqlara rast gəlmirdik. 2020-ci ildən çap olunan dərsliklərdə dil qaydaları ilə

bağlı kifayət qədər tapşırıqlar öz əksini tapmışdır. “Söz boğçası” rubrikası şagirdlərin söz ehtiyatını zənginləşdirmək məqsədi daşıyır. Bu rubrikada sözlərlə yanaşı, frazeoloji və terminoloji ifadələr də verilir. Bu sözlərin mənimsədilməsi yolları metodik vəsaitdə geniş izah olunur.

“Hüsnxət” rubrikası əl yazısı vərdişlərinin inkişafına xidmət edir. Burada hərflərin konfiqurasiyası və kaliqrafik cəhətdən düzgün yazıya aid nümunələr verilir.

“Sözlərin yazılışı” rubrikası tələffüzü fərqlənən bəzi sözlərin orfoqrafiya normalarına uyğun yazılışını nümayiş etdirir. Burada əsas diqqət sözlərin deyilişi ilə yazılışı arasındakı fərqə yönəldilir.

“Bunları bilməliyik” rubrikasında sadə dil qaydaları haqqında məlumat və bəzi filoloji anlayışların açıqlaması verilir.Dil qaydaları üzrə anlayışlar nəzəri müddəalar şəklində deyil, sadə sxemlər, qaydanı əks etdirən nümunələr şəklində təqdim olunur və onların nitq vərdişinə çevrilməsi üçün tapşırıqlar verilir. I sinfin sonunda ibtidai sinif şagirdi 40-a yaxın sadə filoloji anlayış haqqında təsəvvürə malik olur. Onların arasında yalnız dil qaydaları yox, həm də mətnin təhlili ilə bağlı anlalayışlar da yer almışdır. Məsələn: bənd, misra, sətir, qafiyə, sərlövhə, obraz, baş qəhrəman, xarakter, abzas, açar söz və s. Bu isə mətn üzərində iş zamanı müəllimlə şagirdin ünsiyyətini asanlaşdırır və qavrama prosesinin effektivliyini artırır (Cəfərova, Qasımova, 2023, s. 153).

Tədris prosesində önəmli olan inteqrasiyadan bəhs edək. İnteqrasiya fənlərarası qarşılıqlı əlaqənin ən yüksək, uğurlu və elmi formasıdır. Belə ki, müəllim dil qaydalarını öyrədərkən inteqrasiyanı diqqət mərkəzində saxlamalıdır.

İnteqrasiya təhsil islahatının əsas prinsiplərindən biri olduğu, biliklərin möhkəmləndirilməsinə əlverişli şərait yaratdığı üçün dərs zamanı onun reallaşmasına diqqət yetirmək lazımdır.

Ana dili tədrisində şüurluluq prinsipinin də böyük əhəmiyyəti vardır. Əgər şagird qrammatik qaydanı başa düşmədən əzbərləyib, lakin təcrübədə tətbiq edə bilmirsə, belə təlimin faydası olmaz. Təlim materialının şüurlu mənimsənilməsi birbaşa onun möhkəmliyini təmin edir. Bilik, bacarıq və vərdişlərin möhkəm olması üçün müxtəlif tipli çalışmaların köməyi ilə müəllim təkrara yol verməlidir.

Həmçinin şagirdlərdə düzgün qrammatik məfhum yaratmaq üçün öyrənilən məfhumun mahiyyətini, əsas xüsusiyyətlərini bilməklə yanaşı, onun daha sürətli, möhkəm və dərin mənimsənilməsinə yardım edən təhsilin şərtlərini də bilmək lazımdır. Şagirdlər, adətən, qrammatik təhlil prosesində sözün yalnız leksik mənasına diqqət yetirir, onun morfoloji əlamətlərini unudurlar. Sözün leksik mənası

üzərində işləyərkən müəllim tədris prosesində sözyaradıcı əlaqələri unutmamalıdır. Leksikanın mənimsənilməsində şagirdlərin eyni kökdən olan sözlərə müraciət etməsi həmin ifadələrin daha yaxşı başa düşülməsini təmin edir.

Araşdırmalar göstərir ki, omonimlər haqqında təsəvvürü praktik yolla yaratmaq mümkündür. İbtidai sinif şagirdi mətndə tərkibində omonim sözlərin olduğu birləşmələri müqayisə edir, müəllimin köməyi ilə onların mənalarını açmış olur.

IV sinif Azərbaycan dili dərsliyində xronologiya, annotasiya, sitat haqqında məlumat verilib. Amma paronim anlayışının adı çəkilməyib.

**Diqqət edin:** Dilimizdə elə sözlər var ki, oxşar səslənir, lakin mənasına görə fərqlənir.

əsr – 100 illik dövr

əsir – müharibədə ələ keçirilən düşmən əsgəri

*Tapşırıq Ç*-də lüğətdən istifadə edərək verilmiş sözlərin izahını yazın.

həsr – həsir

mətn – mətin

əmr – əmir

xeyr – xeyir (İsmayılov və b., 2022, s. 19).

Bu tapşırıqda həsir, mətin sözlərinin mənasını təcrübəli müəllim açmalı və şagirdlərin qeyri-fəal lüğət fondundakı sözləri fəal lüğət fonduna gətirməlidir. İfadəli oxunun təlimi əhəmiyyətindən biri, bəlkə də, birincisi sözə və söz sənətinə maraq və məhəbbət tərbiyə etməsidir. Ədəbiyyatçı Soltan Hüseynoğlu haqlı olaraq qeyd edir ki, "söz şagirdə təsir etmək üçün müəllimin ixtiyarında olan güclü vasitədir. Müəllimin sözdən bacarıqla istifadə etməsi, öz nitqini, səsini ustalıqla idarə etməsi onu bir pedaqoq kimi səciyyələndirən mühüm keyfiyyətdir" (Hüseynoğlu, 2019, s. 8).

*Tapşırıq C*-də qruplarla iş verilib.

Aşağıdakı mövzular üzrə elan hazırlayın və təqdim edin:

**I qrup:** Uşaq yazıçısı Zahid Xəlillə görüş.

**II qrup:** "1 iyun – Uşaqların Beynəlxalq Müdafiəsi Günü"nə həsr olunmuş sərgi.

**III qrup:** "Şən uşaqlar" özfəaliyyət dərnəyinin konserti.

**IV qrup:** "Qarabağ Azərbaycandır!" mövzusunda şeir müsabiqəsi (İsmayılov və b., 2022, s. 18).

İbtidai sinif dərsliklərində əməli yazı qaydalarına aid nümunələr də öz əksini tapmışdır.

*Tapşırıq E*-də cütlərlə iş verilib. Terminlərin aid olduğu elm sahəsini müəyyənləşdirin və mənalarını yazmaqla terminlər lüğəti hazırlayın.

Diametr, radius, not, pauza, tənlik, himn, solo, portret, xor, nəqarət, illüstrasiya, peyzaj, qrafika, ədəd oxu (İsmayılov və b., 2022, s. 81).

Yuxarıda təqdim edilən tapşırıqda fənlərarası inteqrasiya verilib. Bir məsələyə də diqqət yetirmək lazımdır ki, müəllim tapşırıqda deyilişi ilə yazılışı fərqli sözlərə də toxunmalıdır.

Bəs fəal təlim hansı prinsiplərə əsaslanmalıdır? Bu gün təməli ibtidai sinifdən qoyulan kiçik yaşlı məktəblilərə bu prinsiplər necə aşılanır?

Təlim fəaliyyətində aşagıdakı prinsiplərin nəzərə alınması müəllimin peşəkarlığının əsas göstəricisi sayılır:

- şagird nailiyyətlərinin qiymətləndirilmə prinsipləri və formaları;
- təlimin təşkilində istifadə olunan fəal interaktiv təlim üsulları;
- dərsin mərhələlər üzrə planlaşdırılması (gündəlik, illik).

Bu gün təlimdə yeni texnologiyalardan istifadə etməklə təhsilin keyfiyyətinin yüksəldilməsi hər bir müəllimin əsas məqsədi olmalıdır. Sonda onu qeyd edim ki, bu mövzu ilə bağlı araşdırmalara ehtiyac vardır.

## Nəticə

Azərbaycan dili dərsliyini şagirdlərin bilik səviyyəsinə uyğun olaraq, sistemli şəkildə onlara öyrətmək, mənimsətmək məqsədini güdür. Buna görə də məktəb üçün yazılan Azərbaycan dili dərsliyi nəzəri və praktik cəhətdən mükəmməl olmalıdır. Metodika məhz şagirdlərin təlim materiallarını mənimsəmə şəraitini təhlil edərək daha əlverişli sistem qurmaqda müəllimə kömək edir. İbtidai məktəbdə tətbiq olunan yeni tədris proqramları şagirdlərə veriləcək biliklərin elmi səviyyəsinin yüksəldilməsinə, onların idrak fəaliyyətlərinin inkişafına, ideya-mənəvi və estetik tərbiyəsinin gücləndirilməsinə doğru yönəldilməlidir.

**Ədəbiyyat**


1. Cəfərova, N., Qasımova, M. (2023). *İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası*.
2. Cəfərova, N. (2023). *Oxu təliminin metodikası*.
3. Hümmətova, R. (2019). *Ana dili-II* (dərs vəsaiti).
4. Hümmətova, R. (2023). *Müasir Azərbaycan dili* (sintaksis).
5. Hüseynoğlu, S. (2019). *İfadəli oxunun əsasları*.
6. İsmayılov, R., Nurullayeva, Ü., Zahidova, Ş., Bayramova, İ., Xanalıyeva, A., Cəlilova, K. (2022). *Azərbaycan dili III sinif* (I hissə).
7. İsmayılov, R., Nurullayeva, Ü., Zahidova, Ş., Bayramova, İ., Xanalıyeva, A., Cəlilova, K. (2022). *Ümumi təhsil müəssisələrinin 4-cü sinifləri üçün Azərbaycan dili fənni üzrə dərslik*. I hissə. Altun kitab.
8. İsmayılov, R., Nurullayeva, Ü., Zahidova, Ş., Bayramova, İ., Xanalıyeva, A., Cəlilova, K. (2022). *Ümumi təhsil müəssisələrinin 4-cü sinifləri üçün Azərbaycan dili fənni üzrə dərslik*. II hissə. Altun kitab.
9. İsmayılov, R., Nurullayeva, Ü., Zahidova, Ş., Bayramova, İ., Xanalıyeva, A., Cəlilova, K. (2023). *Ümumi təhsil müəssisələrinin 4-cü sinifləri üçün Azərbaycan dili (tədris dili) fənni üzrə dərsliyin metodik vəsaiti*.
10. Nurullayeva, Ü., Bayramova, İ., Xanalıyeva, A., Məhyəddinova, K. (2020). *Azərbaycan dili* (tədris dili). *Ümumtəhsil məktəblərinin 2-ci sinfi üçün Azərbaycan dili fənni üzrə dərslik*. II hissə.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 57–65
https://doi.org/10.48445/k8528-1913-8667-v

# Yazarın dil kimliyinin ifadəsində sinesteziya faktoru – qavrayış spesifikasının inikası kimi

***Bənövşə Məmmədova*** [1]

**XÜLASƏ**
*Bədii əsər formatında dil şəxsiyyətinin reprezentasiyası zamanı ən çox maraq doğuran məqamlardan biri, bu və ya digər konkret qələm sahibinin fərdi idiolekt və ideostil özəlliyinin təzahürü kimi ortaya çıxan intermediallıq faktları ilə bağlıdır. Qeyd edək ki, bilavasitə qavrayış spesifikliyi ilə şərtlənən intermediallıq hadisəsi ətraf aləmdən mənimsənilən və hissiyyat orqanları tərəfindən qəbul edilən informasiyanın emalı texnologiyası ilə tənzimlənir. Belə ki, sinestezial qavrayış tərzinə malik insanlarda bu mədəniyyət sahələrarası əlaqənin daha əyani şəkildə təzahür tapmasına və həmin hadisənin birbaşa formada qavrayış modeli ilə bağlılığına şübhə yeri qoymur. Bu baxımdan, dil şəxsiyyəti nəzəriyyəsinin maraq dairəsinin neyrofizioloji proseslərlə bağlı dil-təfəkkür reallıqlarına köklənməsi tam anlaşılandır. Məqalədə Azərbaycan və ingilisdilli yazarların dil kimliyində sinestezial qavrayışın xüsusiyyətləri şərh edilir və onların əsaslandırılmasında konkret nümunələrdən istifadə olunur.*

**AÇAR SÖZLƏR**
*yazarın dil kimliyi, sinesteziya, dildə qavrayış faktoru, dil mədəniyyətlərarası konseptdə*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 14.03.2025
Qəbul edilib: 02.05.2025

[1] Filologiya üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dillər Universiteti. Azərbaycan. https://orcid.org/0000-0002-2578-1363 | benovshem.m@gmail.com

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 57–65
https://doi.org/10.48445/k8528-1913-8667-v

# The Factor of Synesthesia in the Expression of the Author's Linguistic Identity – As an Indicator of Perceptual Specification

***Banovsha Mammadova*** [1]

**ABSTRACT**

*One of the most interesting aspects of the representation of language identity in the format of a work of art is related to the facts of intermediality, which appear as a manifestation of the individual idiolect and ideostyle of a particular writer. It should be noted that the phenomenon of intermediality, which is directly conditioned by the specificity of perception, is regulated by the technology of processing information acquired from the surrounding world and received by the sensory organs. Thus, there is no doubt that in people with a synesthetic perception style, this intercultural connection is more clearly manifested and that this phenomenon is directly related to the perception model. From this point of view, it is quite understandable that the field of interest of the theory of language identity is rooted in the realities of language and thinking related to neurophysiological processes. The article comments on the features of synesthetic perception in the language identity of Azerbaijani and English-speaking writers and uses specific examples to substantiate them.*

**KEYWORDS**

*language identity of the author, synesthesia, perception factor in language, language in the intercultural concept*

**ARTICLE HISTORY**

Received: 14.03.2025
Accepted: 02.05.2025

---

[1] Doctor of Philosophy in Philology, Associate Professor, Azerbaijan University of Languages. Azerbaijan. https://orcid.org/0000-0002-2578-1363 | benovshem.m@gmail.com

 

## Giriş

Məlumdur ki, sinestetik qavrayış qabiliyyəti, yəni bir hissin digər bir hiss ilə əlaqələndirilərək dərk edilməsi, primitiv səviyyədə bir çox insanlarda müşahidə olunur. Bu fenomen, beyində müxtəlif hissiyyat orqanlarından alınan informasiyanın emalı zamanı meydana çıxır. Fərqli duyğu sistemlərinin qarşılıqlı əlaqəsi və neyronların sıx təması nəticəsində müxtəlif duyğular arasında bağlantılar yaranır, bu da dilə öz təsirini göstərir. Nəticədə, dünyanın demək olar ki, bütün dillərində metaforik ifadələr formalaşır. Məsələn, şirin xatirələr (dad duyğusu ilə əlaqələndirilmiş müsbət emosiyalar), acı həqiqət (dad və duyğu arasında bir əlaqə), kəskin (iti) söz (toxunma və vizual duyğu ilə əlaqələndirilən təsir), işıqlı sima (insanın vizual obrazı ilə müsbət təəssüratın əlaqəsi) kimi ifadələr gündəlik ünsiyyət prosesində tez-tez istifadə olunur. Bu metaforik keçidlər yalnız dilin bədii ifadəliliyi üçün zəmin yaratmır, həmçinin insan təfəkkürünün, qavrayışının mürəkkəbliyini və universallığını əks etdirir. Bu fenomenin araşdırılması dilin emosional, mədəni xüsusiyyətlərini daha dərindən anlamağa, eləcə də müxtəlif mədəniyyətlərin qavrayış modellərinin oxşar və fərqli xüsusiyyətlərini müəyyən etməyə imkan yaradır.

## Metodlar

Məqalədə müqayisə, təsvir və linqvistik təhlil metodlarından istifadə olunmuş, təqdim edilən nəzəri məlumatlar ədəbi nümunələrlə izah edilmişdir.

## Nəticələr

– Yazarın dil kimliyinin ifadəsində sinesteziya faktorunun bir qavrayış spesifikası kimi inikasının təhlili əsasında məlum olmuşdur ki, yaradıcı şəxslərin yalnız məhdud qrupu üçün xarakterik olan sinestezial qavrayış özəlliyi ingilisdilli qadın müəlliflərindən daha çox A. S. Byattın dil kimliyi üçün səciyyəvidir.

– S. Byatt "rəngli qavrayış" özəlliyinə malik olduğundan, onun fərqli məzmunlu əsərlərində məhz bu tip sinestezial ifadə formalarına geniş şəkildə yer verilmişdir.

– Yazarın audial qavrayışının sinestezial planda reallaşmasının təhlili bu qavrayış tərzinin (sinesteziyanın) dil kimliyini yönləndirə bildiyini ortaya qoymuşdur. İnsanların qavrayış tərzinə görə vizual, audial, kinestetik və diskret

olaraq qruplaşdırılması, müasir psixolinqvistik, neyrolinqvistik istiqamətli araşdırmaların yeni təhlil istiqamətini müəyyənləşdirmişdir.

– Məlum olmuşdur ki, ingilisdilli yazarların əsərlərində geniş şəkildə təzahür edən audial formatlı bənzətmə və metaforalar daha çox səslərin akustik obrazlarına (təqlidi sözlərə və onomatopik səs komplekslərinə) üstünlük verilməsinə, hadisələrin məhz akustik tərtibat baxımından təsvirinin əsas götürülməsinə istinad edir.

**Müzakirə**

Sinestezial şifrələmə, yəni müxtəlif duyğu sistemləri arasındakı əlaqələrin bədii ifadə formaları kimi istifadəsi böyük potensiala malik bir sahə olsa da, ədəbiyyat və dil araşdırmalarına aid mövzular hələ də geniş şəkildə tədqiq edilməmişdir. Gələcəkdə bu fenomenin tədqiqi müxtəlif istiqamətlərdə aparıla bilər.

Gələcək tədqiqatlar sinestezial şifrələmənin yalnız ədəbi ifadəsinin texniki tərəfini deyil, həm də insan qavrayışının universal mexanizmlərini əks etdirdiyini göstərə bilər. Bu mövzu ədəbiyyatşünaslıq sahəsi ilə yanaşı, psixologiya, dilçilik və mədəniyyət sahəsi üzrə tədqiqatlar üçün də böyük əhəmiyyət kəsb edir.

İşarənin ikili təbiəti aspektində sinestezial kodun deşifrəsi dilçilər üçün xüsusi maraq doğurur. Pofessor F. Veysəlli haqlı olaraq qeyd edir ki, *“beyindəki prosesləri öyrənməklə dil funksiyalarını aydın dərk etmək olar. ...Bugünkü dilçilik birmənalı şəkildə sübut edir ki, insanı tədqiqatdan kənar etmək olmaz və ümumiyyətlə, insanın mental prosesləri hərtərəfli şəkildə öyrənilməlidir”* (Veysəlli, 2017, s. 100).

Belə ki, (irəlidə izləyəcəyimiz kimi) xüsusi növ intertekstual pərçimlənmələri təcəssüm etdirən intermediallıq faktları özlüyündə semiozis prosesinin reallaşmasını da təcəssüm etdirmiş olur: intermediallığın deşifrəsində həm adresatın, həm də adresantın implisit semantik kodun oxunuşu ilə bağlı hazırlıqlı olması, yəni altşüura xitabən verilən informasiyanı “oxuya” bilən deşifrə texnologiyaların, məlumatların, habelə linqvokulturoloji kodların inventarına malik olması vacibdir. *“İşarə situasiyası akustik işarənin... eksponentləri və akustik obrazlarla, işarələnənlər (işarələrin ifadə etdiyi mənalar, semlər), işarənin konseptləri (işarənin anlamı) və ətraf aləmin əşya və denotatları, referentlərilə səciyyələnir. Öz aralarında fərqlənməyən şeylər dildə fərqləndirmə funksiyası yerinə yetirə bilməz. Danışan göndərdiyi informasiyanı dinləyən həmin informasiyanın göndərildiyi dili bilməzsə, o, dil sistemi ilə tərbiyə olunmayıbsa, heç nə başa düşə bilməz. Deməli, danışmaq və danışanı dərk etmək onların ikisinin birlikdə əmələ gətirdiyi dil fəaliyyətinin deşifrəsidir”* (Veysəlli, 2017, s. 101–102).

Haqqında bəhs edəcəyimiz yazarlardan birinin – T. Morrissonun yaradıcılığındakı intermediallıq faktlarının təsbiti (konstatasiyası) və dolğun təhlili üçün müəllifin afroamerikan diskursuna bağlılığından irəli gələn xüsusiyyətlərini, onun dəyərlər sistemini, aid olduğu etnik-sosial qrupun nitq davranışlarını, afroamerikan ingiliscəsinin “kod sözlər” inventarını, onların mədəniyyət və ənənələrini və s. bilməsi vacibdir. Tədqiqatçılar T. Morrison yaradıcılığında Avropa və afroamerikan xalq mədəniyyətləri nümunələrindən iqtibasların, allyuziyaların yer aldığını qeyd etmişlər. Habelə yazarın əsərlərinin dili üçün zənci mif və rituallarına, inanc və nağıllarına, eləcə də zənci nəğmələrinə “göndərmələrin” xarakterik olduğuna da diqqət çəkmişlər. Xüsusilə T. Morrisonun 1977-ci ildə qələmə aldığı “Song of Solomon” romanını təhlil edən araşdırmaçılar əsər boyu leytmotiv kimi səsləndirilən *blyuz və zənci ritual nəğmələrinin motivlərinin* bədii təhkiyənin gücünü artırmağa yönəldiyini vurğulayırlar (Pukhnataya, 1991). Deməli, yazıçı yalnız intellektual proseslərin vasitəsilə təhkiyənin mənasına toxunmaqla kifayətlənmir, oxucusunun altşüuruna təsir edərək onun sinestezial potensialını işə salır və fon effekti ilə intermedial intertekstemi də hipermətnə daxil edir, “pərçimləyir”.

R. E. Cytowic-in araşdırmalarından məlumdur ki, sinesteziya (yunan dilində *syn* “birgə”, *aisthesis* “qavrayış”) – qeyri-ixtiyari kross-modal assosiasiyalar təcrübəsini, qabiliyyətini ehtiva edir. Özü ilə multisensor mahiyyətli prosesi təcəssüm etdirən bu qavrayış növü bir sensor modallığın digər sensor modallığa keçidini asanlıqla təmin edir. Əsasən sol yarımkürənin fəaliyyəti sayəsində ortaya çıxdığı ehtimal edilən bu fenomenin daha çox qadınlarda və solaxay şəxslərdə müşahidə olunduğu diqqətə çatdırılır (Cytowic, 2002).

Bu məqamda bir qədər haşiyəyə çıxaraq, obyektivlik naminə onu da qeyd etmək istərdik ki, sinestezial qavrayış problemi ilə bağlı təcrübi araşdırmalarda bu xüsusiyyətin təzahür nisbəti (faiz göstəriciləri) ilə bağlı müxtəlif fikirlər səslənməkdədir. Belə ki, Y. Boytsova bu yanaşmalardakı rəqəm dəqiqliyinin mövcud olmadığını bildirərək qeyd edir ki, bəzi tədqiqatçılar bu özəlliyin yalnız hər 25–100 min insandan birində təsadüf olunduğu fikrini iddia edirlər (Boytsova, 2014). Halbuki digər qrup tədqiqatçılara görə, yetkin insanların təxminən 50 %-də, azyaşlıların isə 15 %-də sinestezial qavrayış əlamətlərinin mövcudluğu sübut edilir (Cytowic, 2002, p. 22).

Maraqlıdır ki, A. Rich və həmkarları yalnız 1150 qadın və 7150 kişidən birində əsl klassik anlamlı sinestezial qavrayış qabiliyyətinin mövcudluğunu təsbit etmişlər ki, bu da özlüyündə qadın və kişi beyin aparatının informasiyanın qəbulu və emalı

zamanı müvafiq xarakterli asimmetriya nümayiş etdirməsi ilə bağlı elmi faktları bir daha əyaniliklə təsdiqləmiş olur (Rich & Bradshaw, 2005, p. 53, p. 77).

Tədqiqatımızın obyektini bilavasitə qadın yazarların dil şəxsiyyəti kontekstində intermediallıq faktları və sinesteziya qabiliyyətinin verbal ifadəsi təşkil etdiyindən, bu məqamda bir qədər haşiyəyə çıxıb, qeyd olunan məsələlərlə bağlı gender fərqliliyi amilinə diqqət çəkmək istərdik. Daha öncə R. E. Cytowic-dən gətirilən iqtibasda da bildirildiyi kimi, sinestezial qavrama daha çox qadınlarda təsadüf edilir ki, bu da avtomatik olaraq (yəni məntiqi əlaqələndirmə ilə) qadın yazarların intermediallıq fenomeninə "daha açıq" olması və bu məsələlərə daha çox yaradıcı kreativlik (творческая креативность) potensialı nümayiş etdirə bilməsini ehtimal etməyə əsas verir. Deməli, burada emosional intellekt, sinestezial qavrayış və intermediallığın yaratdığı üçlü korrelyasiya, yəni bir növ implikativ əsaslı şərtlənmə meydana çıxır. Belə ki, məlum olduğu kimi, qadınların emosional intellekti kişilərə nisbətən daha yüksək səviyyədə inkişaf etmişdir (Derevyanko, 2007, s. 108–112). Emosional intellekt isə özlüyündə sinestezial qavrayış fenomeni ilə üzvi şəkildə bağlılığa malikdir; biri digərinin təzahür intensivliyini müəyyənləşdirir.

Onu da qeyd edək ki, emosional intellektin təzahüründəki gender asimmetriyası məqamı ilə razılaşmayan tədqiqatçıların özləri də apardıqları təcrübi araşdırmalarda kişilərin bəzi məqamlarda daha yüksək emosional intellekt nümayiş etdirdikləri halda, digər insanların emosional durumlarının yozulmasında və insanlara qarşı emosiyaların ifadə edilməsində qadınların emosional intellektinin nəzərəçarpacaq dərəcədə daha yüksək olduğunu tam əyaniliklə ortaya qoymuşlar (Minullina, 2014, s. 130). Bu da bir çox obyektiv səbəblərlə izah edilə bilər ki, buraya ilk olaraq, filogenestik proses zamanı insan fərdlərinin psixo-emosional səriştələrinin inkişaf edərək cilalandığı zaman qadınların ana olması və dil bilməyən körpəyə qulluq edərkən onun üz mimikalarına, habelə körpənin heç bir anlam kəsb etməyən qığıltı və nidalarına əsasən, fiziki, emosional və psixoloji durumunu müəyyənləşdirmək öhdəliyinin olması ilə şərtlənir. Məhz bu məqama diqqət edən Allan və Barbara Piz özlərinin "Bədən dili" araşdırmasında qadınların hələ erkən yaşlardan etibarən qarşı tərəfin emosional durumunu "oxumaq", onun mimikriya səriştəsi sayəsində ustalıqla təqlid etmək, eləcə də qarşı tərəfi öz emosional durumunun təsiri altına salmaq (yəni emosional cəhətdən manipulyasiya etmək) bacarığının mövcud olduğunu vurğulamışlar. Allan və Barbara Piz hətta "Telepatiya" kitabının müəllifi Sanjida O′Connellin beş aylıq təcrübi araşdırmalarına istinadən onu da qeyd etmişlər ki, qa-

dınlar məhz səriştələri sayəsində həm yalanı "oxumaq", həm də yalan danışmaq baxımından daha bacarıqlı olurlar (Minullina, 2014, s. 167–168).

Bilavasitə sinestezial qavrayışla bağlı məqama qayıdaraq qeyd edək ki, bədii ədəbiyyatda, xüsusilə romantik diskursda sinestezial qavrayış özəlliklərinin metaforik reprezentasiya mexanizmi kimi istifadə edilməsi halları məhz qadınlarda daha çox müşahidə olunur.

Konkret olaraq, dilçilər sinesteziyanın ayrı-ayrı şəxslərin emosional psixofizioloji durumların ifadəsi zamanı, habelə müvafiq xarakterli metaforik keçidlərin formalaşdırması kontekstində müəllifin dil kimliyinə ciddi şəkildə təsir göstərdiyini də ortaya qoymuşlar (Mamtseva, 2018, s. 10–11; s. 17; s. 20–22).

Bu kontekstdə görkəmli ABŞ psixoloqu, psixolinqvistik Charles Osgoodun fikirlərini xatırlatmaq yerinə düşərdi. Belə ki, alim, əslində, poeziya və ümumilikdə "bədii ədəbiyyatın əsasını təşkil edən metafor yaratmaq meyilliliyinin", metafor yaratmaq potensialının əsasında məhz sinesteziya ilə bağlılıq təşkil edən proseslərin durduğunu irəli sürmüşdür. Ch. Osgood, ümumiyyətlə, bu bacarığı, yəni təəssüratların obrazlar vasitəsilə, fərqli hissiyyat orqanlarından gələn informasiyanın sintezi şəklində ifadə edilməsini bilvasitə insan zəkasının fərqləndirici xüsusiyyəti olduğu fikrini də qeyd etmişdir. Bu isə, öz növbəsində, ibtidai səviyyədə sinestezial qabiliyyətin, əslində, bəşər övladı üçün xarakterik olduğuna və onun nitqinin metaforik aparatının baza mexanizmləri sırasında yer aldığına şübhə yaratmır.

Bədii diskursda bu qavrayış növünün təzahür formaları məqamına qayıdaraq qeyd edək ki, ingilisdilli qadın ədəbiyyatında sinestezial metaforikləşmənin təkcə audial qavrayışla bağlılığı faktları geniş yer almır. Burada həmçinin vizual qavrayışın verballaşması kontekstində ortaya çıxan sinesteziya faktları ilə qarşılaşırıq. Məsələn, A. S. Byattın "Still Life" əsərini bu aspektdən araşdırmış N. S. Bochkareva və O. İ. Qrafova yazırlar: *"Verbal və vizual reprezentasiya problemləri, sözün sinesteziyası, anlamın fərqli interpretasiyaları ...problemləri Bayet romanındakı fərqli diskursların (ilahiyyat, fəlsəfi, elmi, filoloji və s.) kəsişmə "nöqtələrində" bərqərar tapır. Bu isə eyni zamanda eksfrastik ekspozisiyanın elementlərində də təzahür olunur"* (Bochkareva, 2014, s. 197).

İncəsənət, rəsm və heykəltəraşlıq əsərlərinin, memarlıq abidələrinin verbal reprezentasiyasını əks etdirən mətnlərin, yəni ekfrastik ekspozisiyaların tədqiqi məsələləri bilavasitə linqvistik problem kimi müasir linqvistik tədqiqatların, o cümlədən dil kimliyi nəzəriyyəsi ilə kəsişən tədqiqatların maraq dairəsinə daxil olmaqdadır. Bu heç də təsadüfi deyil. Belə ki, özünün də müsahibələrindən birində

etiraf etdiyi kimi, A. S. Byatt yazacaqlarını öncə "rəngli obrazlar" vasitəsilə təsəvvür etdikdən sonra onların təhkiyə formatında reallaşdırmasına keçid edir (*"I like to write about painting because I think visually. I see my writing as blocks of color before it forms itself. I think I also care about painting because I'm not musical. Painting to me is not a metaphor for writing, but something people do that can never be reduced to words"*) (Byatt, 1990). Özünün "Chromatic Darkness: The Color Sequences in A.S.Byatt's Little Black Book of Stories" mövzulu araşdırmasında J. Schumacher də bu məqamı xüsusilə diqqətə alaraq qeyd edir ki, A. S. Byatt özünün müxtəlif vaxtlara aid (2007, 2011) şəxsi söhbətlərində də dəfələrlə etiraf etmişdir ki, koloristik persepsiya (rəngli qavrayış) onun ətraf aləmin mənimsənilməsi prosesində mühüm yer tutur. O, Byatt təhkiyəsində rənglərin "oyunundan" implisit məna ötürücülük vasitəsi kimi istifadə olunduğunu da vurğulamışdır.

**Nəticə**

Yazarın dil kimliyinin ifadəsində sinesteziya faktorunun qavrayış spesifikası kimi əks olunmasının təhlili göstərdi ki, bu xüsusiyyət yaradıcı fərdlərin yalnız məhdud bir qrupu üçün xarakterikdir. Xüsusilə sinestezial qavrayışın, yəni fərqli hiss orqanlarından gələn məlumatların bir-biri ilə əlaqələndirilərək dərk edilməsinin, ingilisdilli qadın müəlliflərindən daha çox A. S. Byattın dil kimliyinə xas olduğu müəyyən edilmişdir. A. S. Byattın "rəngli qavrayış" xüsusiyyəti onun fərdi yaradıcılığında mühüm rol oynayır. Bu xüsusiyyət onun əsərlərində məzmun və forma baxımından sinesteziyanın
bədii ifadələr vasitəsilə özünü göstərməsilə diqqəti cəlb edir. Əsərlərində müxtəlif duyğu sahələrinin bir-birinə bağlanması yolu ilə yaradılan sinestezial təsvirlər və metaforlar oxucuda daha dərin emosional və estetik təsir oyadır. Beləliklə, A. S. Byattın əsərlərində sinesteziyanın geniş tətbiqi, onun dil kimliyini formalaşdıran əsas faktorlardan biri olaraq çıxış edir və müəllifin yaradıcılıq dünyasında rəng, səs, dad və digər duyğuların vəhdətini ön plana çəkir. Bu onun əsərlərinə oxucular tərəfindən xüsusi diqqət və maraqla yanaşılmasına səbəb olur.

## Ədəbiyyat

1. Veysəlli, F. Y. (2017). *Dilçiliyə giriş*. Mütərcim.
2. Boytsova, Yu. (2014). Sinesteziya kak vozmozhnaya osnova tvorchestva. *Nauka i innovatsii*, 142(12), 20–23.
3. Bochkareva, N. S., & Grafova, O. I. (2014). Ekfrasticheskaya ekspozitsiya v romane A. S. Bayyett «Natyurmort». Vestnik Permskogo Universiteta. *Rossiyskaya i zarubezhnaya filologiya*, 28(4).
4. Byatt, A. S. (1990). *Blocks Quotations* (Electronic resource). https://www.quotetab.com/a-s-byatt-quotes-about-blocks#851gb6vU 6qKm6E1d.97Cytowic, R. E. (2002) *Synesthesia: A Union of the Senses.* 2nd ed. The MIT Press.
5. Derevyanko, S. P. (2007). Emotsional'nyy intellekt: problemy kategorial'nosti. *Psikhologiya v sovremennom informatsionnom prostranstve: materialy mezhdunar. nauch. konfer*. Ch. 1. (s. 108–112).
6. Minullina, A. F., & Murtazina, E. I. (2014). Issledovaniye kharakteristik emotsional'nogo intellekta i pokazateley tolerantnosti k neopredelennosti u muzhchin i zhenshchin. *Gumanitarnyye issledovaniya v Vostochnoy Sibiri i na Dal'nem Vostoke*, 125–130.
7. Mamtseva, V. V. (2018) *Reprezentatsiya ol'faktornosti v romanticheskom diskurse.* Avtoreferat diss. kand. filol. nauk.
8. Pukhnataya, S. L. (1991). *Khudozhestvennaya proza Toni Morrison* (Novyye tendentsii v sovremennoy negrityanskoy literature SShA): diss. kand. filol. nauk.
9. Rich, A. N., Bradshaw, J. L., & Mattingley, J. B. (2005). A systematic, large-scale study of synaesthesia. Implications for the role of early experience in lexical-colour associations. *Cognition*, 98(1), 53–84.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 66–75
https://doi.org/10.48445/x5498-2085-9701-b

# Seyid Əzim Şirvaninin yaradıcılığında maarifçilik ideyaları və multikultural dəyərlər

***Pərixanım Soltanqızı (Hüseynova)*** [1]

**XÜLASƏ**
*Məqalədə maarifçiliyin və tənqidi realizm məktəbinin davamçılarından olan Seyid Əzim Şirvaninin XIX əsrin I yarısından II yarısınadək davam edən yaradıcılığı tədqiq edilir, maarifçilik ideyalarından söhbət açılır, satiralarında cəhalətə, nadanlığa qarşı çıxması diqqət mərkəzinə gətirilir. Şairin "Müctəhidin təhsildən qayıtması", "Cahil ata ilə alim oğul", "Alimi-biəməl vaqiəsi" və digər əsərlərində ruhani təhsilin gərəksiz, dünyəvi elmləri öyrənməyin isə daha faydalı olduğu diqqətə çatdırılır. Onun "Mircəfərə xitab", "Guş qıl", "Həzrəti İsa qissəsi", "Həzrəti İsanın hekayəsi", "Sünni və şiə", "Qurani-hədis" əsərlərində multikultural dəyərlər araşdırılır, sənətkarın multikultural, tolerant ədib olması nümunələrlə əsaslandırılır. Ədibin digər xalqların dininə, peyğəmbərlərinə olan rəğbəti bədii-elmi baxımdan geniş şərh edilir. Tədqiqatda şairin əsərlərinin bəşəri xarakter daşıdığı, onun kamil ictimai satirik şair səviyyəsinə qədər yüksəldiyi bədii detallarla qeyd olunur. Məqalədə elmi polemika aparılır və tədqiqatçı elmi-nəzəri mülahizələrini sitatlarla əsaslandırır.*

**AÇAR SÖZLƏR**
*maarifçilik, satira, multikultural dəyərlər, tolerantlıq*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 12.02.2025
Qəbul edilib: 29.04.2025

[1] Filologiya üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. https//orcid.org/0000-0001-9391-6162 | huseynovaperixanim1962@gmail.com

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 66–75
https://doi.org/10.48445/x5498-2085-9701-b

# Enlightenment Ideas and Multicultural Values in of Seyid Azim Shirvani's Work

***Parikhanim Soltangizi (Huseynova)*** [1]

**ABSTRACT**

*The article examines the creative work of Seyid Azim Shirvani, one of the followers of the school of enlightenment and critical realism, from the first to the second half of the 19th century, discusses the ideas of enlightenment, and focuses on his opposition to ignorance and ignorance in his satires. In the poet's works "The Return of the Mujtahid from Education", "The Ignorant Father and the Wise Son", "The Story of the Scholar-Bi'mal" and others, it is brought to the attention that spiritual education is unnecessary, and studying secular sciences is more useful. In his works "Address to Mirjafar", "Speak softly", "The Story of Hazrat Isa", "The Story of Hazrat Isa", "Sunni and Shia", "Quranic-Hadith" multicultural values are examined, and the fact that the artist was a multicultural, tolerant writer is substantiated with examples. The writer's sympathy for the religions and prophets of other peoples is widely commented on from an artistic and scientific perspective. The study notes with artistic details that the poet's works are humane in nature, and that he rose to the level of a perfect social satirical poet. The article conducts a scientific polemic, and the researcher substantiates his scientific and theoretical considerations with quotations.*

**KEYWORDS**

*enlightenment, satire, multicultural values, tolerance*

**ARTICLE HISTORY**

Received: 12.02.2025
Accepted: 29.04.2025

---

[1] Doctor of Philosophy in Philology, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. https//orcid.org/0000-0001-9391-6162 | huseynovaperixanim1962@gmail.com

 

**Giriş**

Məqalədə XIX əsrin görkəmli simalarından olan Seyid Əzim Şirvani yaradıcılığında maarifçilik ideyaları, multikultural dəyərlər və tolerantlıq araşdırılmış, şairin poeziyası müxtəlif istiqamətlərdə tədqiqə cəlb edilmişdir. Tədqiqat zamanı maarifçi şairin satiraları, maarifçilik ideyaları, multikultural dəyərləri və tolerantlığı təbliğ edən şeirləri təhlil edilmişdir. Azərbaycan satirik poeziyasında Şirvani ədəbi irsinin rolunu müəyyənləşdirmək, onun lirikasını zaman-məkan vəhdətində tədqiq etmək kimi məsələlər tədqiqatın əsas istiqamətini təşkil edir.

Şair 1869-cu ildə Şamaxıda yeni üsullu məktəb açdırır. O, burada Azərbaycan dili və fars dilini, eyni zamanda tarix, coğrafiya, hesab və digər fənləri tədris etmiş, şagirdlərin maariflənməsinə çalışmışdır.

O dövrdə Minqreliya orta məktəbinin müəllimi A. Zaxarov "Qafqaz tatarları arasında xalq təhsili" məqaləsində 1887-ci ildə şairlə görüşdüyünü, onun tədris işləri ilə tanış olduğunu qeyd edərək yazır: "18 ildir ki, məktəbi idarə edir. Dağıstanda təhsil almışdır; fars, ərəb dilləri və bir neçə Dağıstan ləhcələrini bilir. O, birinci dərəcəli şair kimi tanınmaqdadır. ...."İlham dəqiqələri" əsəri Təbrizdə nəşr edilmişdir. "Şirvan xanlığının tarixi" adlı bir əsər də yazmışdır ki, hələ nəşr olunmamışdır" (Sbornik materialov dlya opisaniya mestnosti plemen Kavkaza, 1890).

S. Ə. Şirvani Sədinin "Gülüstan" və "Bustan", o cümlədən digər bədii əhəmiyyət kəsb edən tərbiyəvi əsərlərdən etdiyi tərcümələri, uşaqlar üçün yazdığı maraqlı, kiçik həcmli şeirləri şagirdlərinə oxudurdu. Şair bu əlyazmaları dərslik halında tərtib edərək nəşr olunması üçün Qafqaz maarif idarəsinə təqdim etsə də, onun çapına icazə verilmir. Bu dərslik haqqında F. Köçərli yazır: "Mərhumun tərtib etdiyi kitabçalardan bir nüsxəsi öz dəsti xətti ilə yazılmışdır. Sabiqdə müsəlman şöbəsinin inspektoru olan mütəvəffa Çernyayevskiyə göndərilmişdi. Həmin hekayələrdən bir neçəsini Çernyayevski öz "Vətən dili" kitabına salmışdır" (Köçərli, 2005, s. 40).

F. Köçərli dərsliyə salınmş bəzi nümunələrin təlim üçün yararsız olduğunu qeyd etmişdir: "Xırdaca məzhəkələr və gülməli hekayə yazılıbdır ki, onların hissəsi və nəticeyi-kəlamı dürüst və səhih isə də özləri təlim üçün yaramaz" (Köçərli, 2005, s. 40). Görünür, bu fikirlər Qafqaz maarif idarəsi rəisinin əlində dərsliyi çap etməmək üçün bəhanə olmuşdur.

## Metodlar

Tədqiqat işində Seyid Əzim Şirvaninin həyat və yaradıcılığının müxtəlif cəhətləri araşdırılmışdır. Araşdırmanın əsas məqsədi onun yaradıcılığındakı maarifçilik ideyalarını, sosial və dini tənqidləri, həmçinin dövrünün ədəbi mühitindəki rolunu tədqiq etməkdir. Bu məqsədə çatmaq üçün araşdırmada tarixilik, nəzəriyyə, təhlil, müasirlik, müqayisə və yanaşma metodlarından istifadə olunmuşdur.

Tarixilik metodu ilə Seyid Əzim Şirvaninin əsərlərinin və dövrünün ədəbi xüsusiyyətləri araşdırılmış, şairin yaradıcılığındakı sosial və mədəni təsirlər təhlil edilmiş, həyatının müxtəlif dövrləri arasında əlaqələr qurulmuş, o cümlədən ədəbi dairələrdəki münasibətləri və ictimai fəaliyyəti ön planda təqdim olunmuşdur.

Tədqiqatda həmçinin şairin əsərləri üzərində təhlil aparılmış, şeir dilindəki simvollar, metaforalar və poetik üsullar incələnmişdir. Təhlil zamanı şairin həm ənənəvi Azərbaycan ədəbiyyatına, həm də Qərb mədəniyyətinə təsiri qiymətləndirilmişdir.

## Nəticələr

Seyid Əzim Şirvaninin bədii yaradıcılığı dövrünün sosial, mədəni vəziyyətini əks etdirərək insanın maddi-mənəvi həyatı barədə dərin mülahizələrə yer ayırır. O, yaşadığı cəmiyyət üçün maarifçilik və realizm ideyalarını təbliğ edir, həmçinin şəriətə, dinə qarşı mövqeyini açıq şəkildə ortaya qoyur. Şair əsərləri ilə dinin yanlış təfsirinə, cəmiyyətdəki cahilliyə və tənbəlliyə qarşı mübarizə aparır, insanlara öz həyatını daha yaxşı və mənalı yaşaması üçün düzgün yollar göstərir.

S. Ə. Şirvani şeirlərində daha çox bəşəri və humanist dəyərləri, elm və təhsil uğrunda mübarizəni, eləcə də əxlaqi dəyərlərə əsaslanan həyat tərzini təbliğ edir. Onun satirik şeir və hekayələri dövrünün ideologiyasını ciddi şəkildə tənqid edir, cəmiyyətdəki mövhumat və riyakarlıqla mübarizə aparır. Bu baxımdan, şairin yaradıcılığı həm ədəbi, həm də tərbiyəvi və maarifçi əhəmiyyətə malikdir.

## Müzakirə

Şairin həyatı yalnız bədii əsərlər yazmaq və müəllimlik etməklə keçməmişdir. O, Şamaxıda Məhəmməd Səfa adlı şair dostunun evində təşkil etdiyi “Beytüs-səfa” şeir məclisinə rəhbərlik etmişdir. Bundan əlavə, Qarabağda fəaliyyət göstərən “Məclisi-fəramüşan”ın əsasında Bakıda yaradılmış “Məcməüş-şüara”nın üzvləri ilə

yazışmış, müasirləri arasında böyük şöhrət qazanmış, məclis üzvlərinə tövsiyələr vermiş, onların yaradıcılığına istiqamət vermişdir.

Ey dustlər, ol sərvi-xuraman sizin olsun,
Canan sizin olsun
Seyri-gülü gülzarü gülüstan sizin olsun,
Reyhan sizin olsun
(Köçərli, 2005, s. 33).

“Beytüs-səfa” məclisinin iştirakçılarına xitabən yazdığı bu miraslara nəzər saldıqda (1858–1860), şairin 1850-ci ilin ikinci yarısından ədəbi fəaliyyətə başladığı ehtimal edilir.

Mirzə Şəfi Vazehin əsərlərində olduğu kimi, onun da şeirlərində şəraba, məhəbbətə, sevgiyə, gözəlliyə üstünlük verilir. O, şərabı “abi-həyatdan”, “qədr gecəsindən”, musiqini “dindən” üstün tutur.

Ölümümdür mənim ol ruhi-rəvansız bu gecə,
Gər içəm badeyi-gülgün yerinə abi-həyat.

Başqa bir qəzəlində,

Tökmə meyi-nabı yerə, ey zahidi-gümrah,
Bu xuni-xuda, xuni-şəhi Kərbübəladır.

– deyərək, şərabı Allah və Kərbəla şəhidlərinin qanı ilə eyniləşdirir. Başqa bir qəzəlində isə məscidi meyxanaya, səccadəni bütxanəya, özünü zahidə, badəni dəstəmaz suyuna qarşı qoyaraq dini fanatizmi tənqid edir.

Şair “Qafqaz müsəlmanlarına xitab” şeirini “Əkinçi” qəzetində dərc etdirir. Şair burada bir tərəfdən xalqının elmsizliyindən, dünya mədəniyyətindən bixəbər olmasından şikayətlənib təəssüf hissi keçirirsə, digər tərəfdən isə buna səbəb olan ikiüzlü din xadimlərini kəskin şəkildə tənqid edir.

Digər xalqların sürətlə inkişaf etdiyi, yelkən gəmilərini buxar gəmilərinə çevirdikləri, təyyarə istehsal etdikləri bir dövrdə müsəlmanların hələ də inki şafdan geri qalması şairi dərindən narahat edir. Bu problemi “Müctəhidin təhsildən qayıtması” əsrində də görürük:

Xaçpərəstlər təmam düşdü qabaq,
Tökülüb dalda qaldıq, ay sarsaq!

Aldı əhli-kitab dünyanı,
Şərh edirsən sən indi Quranı?!
(Şirvani, 2005, s. 44).

Müsəlmanları əcnəbilərlə müqayisə etdikdə şairdə yaxşı mənada qibtə hissi yaranır. Soydaşlarının digər xalqlardan geridə qalmamasını, onların inkişaf etməsini vacib hesab edir və bu məqsədə çatmağın əsas yolunu rus təhsilində, rus mədəniyyəti və rus ədəbiyyatında görür. Şair rus mədəniyyətini öyrənməyi zamanın tələbi kimi diqqətə çatdırır. Çünki din fanatları yaxşı bilirdilər ki, xalq kütlələrinin qabaqcıl ideyalara yiyələnməsi sonda onların məhvinə gətirib çıxaracaq. Avam kütlələr və onların övladları maarifləndikcə mövhumatdan, onun əsarətindən xilas olmağın yolunu tapacaqlar. Buna görə də din xadimləri nəinki rus dilini öyrənməyi, hətta bu dildə danışmağı, oxumağı, onlar kimi geyinməyi belə şəriət adından qadağan edir, belələrini "kafir" adlandırırdılar. O zaman rus dili indiki kimi Avropaya açılan bir pəncərə idi. XX–XXI əsrin görkəmli şairi B. Vahabzadə "Knijnoye obozreniye" qəzetinin əməkdaşının "Ana dili və rus dili sizin yaradıcılığınızda nə kimi rol oynayır? Hansı dildə yazırsınız və niyə?" sualına belə cavab vermişdir: "Ana dili – xalqın ruhudur, mənəvi dünyasıdır, psixologiyasıdır. Ana dili özünü və dünyanı ifadə dilidir. Mən ana dilində yazıram, ona görə ki mən yalnız bu dildə fikir və duyğularımı ifadə edə bilərəm. Bu mənada bu dil mənim yaradıcılıq taleyimdir" (Knijnoye obozreniye, 1999, s. 2).

Şair Azərbaycan dili ilə yanaşı, rus dilinə də öz münasibətini açıqlamış, onun dünya dilləri sırasında yerini, mövqeyini yüksək dəyərləndirmişdir: "Bu dil mənim dünyaya açılan qapım və pəncərəmdir", – demişdir.

Şairin "Müctəhidin təhsildən qayıtması", "Cahil ata ilə alim oğul", "Alimi-biəməl vaqiəsi" və digər əsərləri mövzu və ideya baxımından bir-birinin davamıdır. Əsərlərdə gənc müctəhidlərin simasında ruhani təhsili tənqid olunur, övladlarına yeni biliklər verməyən valideynlərin avamlığı, çəkdikləri zəhmətin boşa getməsi real şəkildə təsvir edilir. Ruhani təhsili alan gənclər vətənə döndükdə kənd, qəsəbə əhli onları böyük hörmətlə qarşılayır, onların şərəfinə ziyafətlər verir, qurbanlar kəsir. Başında əmmamə, əynində ruhani libası, çiynində əba, barmağında üzük, saqqalı hənalı, imam geyimli müctəhid məsciddə namaz qılır, minbərə çıxıb vəz etmək üçün xütb edir, Qurandan ayə oxuyur, özünü tərifləyir, Fəxri-Razidən, Beyzavidən, "Tibyan"dan Molla Sədradən, Molla Fətullahdan və digərlərindən danışır, onlarda qüsur tapdığını vəchlə söyləyir, özünü onlarla müqayisə edir, təfsirləri, şərhlərilə

üstün olması ilə lovğalanır, avam camaatı yalanlarına inandırır. Amma bu avamların içində mərd, arif olan kəslər də onun yalanını anlayır, gurlayan səsini "lal" edirlər:

"Leyk bir parə mərdi-danışvər
Anlayıbdır ki, kənddə var nə xəbər.
Boş dəğar olduğun bilib dərhal,
Xövfdən leyk nitqin etmiş lal"
(Şirvani, 2005, s. 43–44).

"Alim oğul və avam ata" əsərində ruhani təhsili üçün 15 il pul xərcləyən ata vətənə dönən oğlundan israrla bu illər ərzində nə əxz etdiyini soruşduqda, ona ünvanlanan suallardan dolayısılə canını qurtara bilməyən oğul atasının avam olduğunu bəhanə edib yaxasını kənara çəkmək istəyir, lakin buna nail ola bilmir. Sonda fəsillərdən yayla qışı anladır. Şair burada avam ata ilə ruhani təhsili almış oğulu qarşı-qarşıya qoymaqla, atanın simasında kənd, qəsəbə sakinlərini, avam kütlələri göstərir. O, övladlarını xərc çəkib ruhani təhsili üçün Nəcəfə, Şama, Qahirəyə və digər şəhərlərə göndərən valideynlərə ruhani təhsilinin mənasızlığını, pullarını havaya sovurduqlarını, övladlarının vaxtını boş şeylərə sərf etdiklərini göstərir.

Şairin "Alimi-biəməl vaqiəsi" satirasında bu problem fərqli bir şəkildə qoyulur. Təhsildən vətənə dönən müctəhidin ona ünvanlanan suallara maraqlı cavabları ilə başlayır. Müctəhidin avam kütləyə xitabən: "Siz bilirsiz əya güruhi-fəqir?" – sorğusuna aldığı: "Bilmirik, elə təqrir (izah)" cavabını bəhanə gətirərək: – bilməyən üçün edim nə bəyan? – deyir. Yenidən müctəhid kütləyə müraciət edərək – "Ki, bilirsiz əya, güruhi-dəvab?" Bu dəfə: – bilirik, –cavabını alır. –"Bilirsizsə, ey bipir, dəxi bica nə eyləyim təqrir". Beləliklə, bilməyən, biləndən soruşsun deyə fırıldaq işlətməklə ondan ruhani elmini əxz etmək istəyənləri yola salır. Məscidə yığışanlar təhsil aldığı şəhərdə eyş-işrətlə gününü keçirən, kitab, dəftər bilməyən, ruhani elmindən xəbəri olmayan imamdan doğru cavab ala bilmirlər.

S. Ə. Şirvani ruhani təhsili əleyhinə yazdığı əsərləri, ictimai məzmunlu satirik şeirləri, mənzum hekayələri, təmsilləri, nəsihətləri ilə cahilliyi, mövhumatı, zalımları tənqid etmiş, bir sözlə, zəmanəsinin eyiblərini açmaqla yanaşı, maarifçi-realist mütərəqqi ideyalar təbliğ etmişdir. Ədibin tərbiyəvi-əxlaqi əhəmiyyətli əsərləri bu gün də öz aktuallığını qorumaqdadır.

S. Ə. Şirvani multikultural, tolerant sənətkar idi. O, hər zaman başqa xalqların dininə, dilinə hörmətlə yanaşmış, onların peyğəmbərlərinə etiqad göstərmişdir.

Əsərlərində İsa, Musa peyğəmbərin adını çəkmiş, onları sevgi ilə, hörmətlə xatırlamışdır. Əsərlərində hər cür dini, irqi ayrı-seçkiliyin, sünnü-şiə məsələlərinin millətlər arasında düşmənçilik məqsədilə ruhanilər tərəfindən salındığını şərh edir, insanları dostluğa, birliyə səsləyir. Gəncləri irəli, yeniliyə çağırır, xüsusilə onlara dünya xalqlarının ədəbiyyatını, mədəniyyətini öyrənməyi tövsiyə edir.

"Seyid Əzim mütərəqqi fikirli düşüncə sahibi kimi ədəbiyyatların qarşılıqlı əlaqəsinə böyük önəm verir, Avropa və rus ədəbiyyatının klassik əsərlərinə maraq göstərir, ibrətamiz öyüd-nəsihətlərində bu fikirlərini təbliğ edirdi" (Quliyeva, 2021, s. 129).

Şair oğluna xitabən yazdığı "Mircəfərə xitab" şeirində Allahın bütün kainat üçün tək olduğunu ərz edir, dinindən, irqindən, millətindən, təriqətindən asılı olmadan hər kəsin ağıllı, ədəbli olması, elm öyrənib təhsilli yetişməsi üçün nəsihətlər verir, özünün mütərəqqi, maarifçi ideyalarını əks etdirir.

Demirəm rus, ya müsəlman ol,
Hər nə olsan get, əhli-ürfan ol.
Demirəm sünni ol və ya şiə,
Tək hədəf olma tiri-təşniə
(Şirvani, 2005, s. 18)

Aşağıda nümunə gətirdiyimiz şeir parçasında şair əsas üç dili öyrənməyin zəruri olduğunu oğlunun diqqətinə çatdırır:

Bizim üçün laməhalə üç dilin təlimi lazımdır.
Biri elmi-ərəbdir ki, bilək mənayi "Quran!"
Biri vacib bizə vətəndə söylənən dildir,
Gərəkdir mətləbə, biz eyləyək türkilə ünvanı
(Şirvani, 2005).

Ərəb, türk və rus dili – bu dilləri bilmək zamanın tələbi idi. Sənətkar bu düşüncəni şərh edir. Ərəb dili "Quran" oxumaq üçün lazım idi. Çünki bu dili bilmədən "Quran"dakı fikirləri, mənanı anlamaq mümkün deyildir. Türk dili ana dili olduğu üçün önəmlidir, çünki hər kəs öz ana dilini bilməyə borcludur. Üçüncü isə rus dilidir ki, bu da rəsmi qayda-qanunları bilmək, icra etmək üçün gərəkdir. Şair eyni zamanda şəriətdə rus dilini bilməyin haram olmadığını və günah sayılmadığını da qeyd edir.

“Guş qıl” müxəmməsində müğənninin səsini, nəğmədə zilini, bəmini, musiqi zövqünü, Həzrəti İsanın hikmətinə, iki dodağı arasındakı mənaya, səsinə, sözünə bənzədir. Necə ki, Həzrəti İsa öz nəfəsi ilə ölüyə həyat, ruh bəxş edir, eləcə də nəğmə dünyanın qəminə məlhəm olur.

İctimai motivli şeirlərində rus dilini bilməyi, bu dildə oxumağı, bu tərzdə geyinməyi haram hesab etməyən, şair “Guş qıl” müxəmməsində musiqini də, musiqi alətlərində ifa etməyi, rəqsi, oxumağı, yazmağı da haram hesab etmir. Müğənninin dəmini Həzrəti İsaya bərabər tutmaqla onların yalanlarına, böhtanlarına uymamağı məsləhət görür və “Həzrəti İsanın qissə”sində onun müqəddəs obrazını yaradır. Hekayədə söylənilir: “Bir gün düz kəlam söyləyən, xudanın nuru bir məkanda gəzərkən bir yəhudi tayfası ilə rastlaşır. Onlar Həzrəti İsaya söyüşlər yağdırırlar. Əvəzində Allahın əzizi onlara dualarla, alqışlarla, afərinlərlə cavab verir. Buna təəccüb edən şagirdləri ona “Cümlə key olan, aləmə rəhbər” – müraciət edərək soruşurlar ki, onlar sizə layiq olmayan münasibətdən başqa nə etdilər ki, siz bu tayfaya xeyir-dua verirsiniz. İsa peyğəmbər: – onlar öz varlarını xərcləyərək iç üzlərini göstərdilər, mən də gizli nəyim var idi, onu göstərdim. Məndə sınıq qab yoxdur, onu göstərim, iri mirvarilərimi xərclədim – cavabını verir”.

“Həzrəti İsanın hekayəsi”ndə xristian peyğəmbəri Həzrəti İsanın gözəl qəlbi, hikmət dolu sözləri və yüksək məqamı təsvir edilir. Hekayənin məzmununu İsanın ətrafa nur paylaması, qurd düşmüş it leşinə təriflər deməsi, heyvanlara məhəbbəti, diqqəti və s. təşkil edir. Hekayədə nəql edilir ki, Həzrəti İsa bir gün beş-on nəfərlə yol kənarında gəzərkən şişmiş bir it leşinə rast gəlir. Hərə leşə baxaraq bir söz deyir: “Biri bədəninə qurd düşüb, digəri qotur basıb” (Şirvani, 2005, s. 216). Eyib axtaranlar itin leşini belə “tərif edirlər”. Həzrəti İsa isə onların əksinə olaraq itin gözəl dişlərinin olduğunu, ondakı qoturu, qurdu bədənindən zühur edən mirvarilər olduğunu söyləyir.

“Sünni ilə şiə” əsərində bir şiə “iki tay” dəni üyütmək üçün dəyirmana aparır. Yolda eşşək palçığa batır, şiə tayların birini palçıqdan çıxarır, digər tayını çıxara bilmir, “Ya Əli” deyib nə qədər cəhd edirsə də mümkün olmur, həmin vaxt bu hadisəni yolla keçən bir sünni görür, ona yardım edir: “Ya Ömər” deyib tayı palçıqdan çıxarır və sübut etməyə çalışır ki, imamın rəhbəri Əli yox, Ömərdir. Gördün ki, “Əli yox, Ömər köməyə gəldi”. Şiə bu sözdən sarsılıb buğdanı taydan boşaldaraq: “Dedi: “Olsun, mənə həram o çörək, Ömərdən ola bu çöldə kömək” (Şirvani, 2005, s. 124).

Ədib hekayədə sünni-şiə məsələlərindən qaynaqlanan mübahisələrin mənasızlığını izah etməyə çalışsa da, onlar gücün, qüvvətin qolda, hünərdə olduğunu avamlıqları üzündən anlamırlar. Şair bu kimi məsələlərdə bir-birinə acıq verən sünni-şiə davalarını ifşa edir, onu mövhumatın, cəhalətin nəticəsi kimi lənətləyir. "Qurani-hədis" şeirində Tövratı, İncili, Zəburu, Quranı anladır, hər birinin, başqa bir dildə yazılmasından, fərqli yaradılışından bəhs edir. Onlardan danışmadan öncə heç bir din, dil fərqi olmayan dörd müqəddəs kitab haqqında məlumat verir.

S. Ə. Şirvaninin mənzum hekayələri sırasında Azərbaycan və Şərq klassiklərindən edilmiş tərcümələr də mövcuddur. Bu əsərləri oğlu Seyid Cəfər Hacı Zeynalabdin Tağıyevin vəsaiti hesabına Təbrizdə çap etdirmişdir.

**Nəticə**

Tədqiqat zamanı aşağıdakı elmi nəticələrə gəlinib:

1. S. Ə. Şirvaninin adı XIX əsr Azərbaycan ədəbiyyatı tarixində ədəbi və nüfuzlu yerə malikdir.
2. S. Ə. Şirvani Füzuli ədəbi məktəbinin davamçısı olaraq, təhsili, elmi təbliğ edən maarifçi-realist, lirik şair, mənzum hekayə və satirik əsərlərin müəllifidir.
3. S. Ə. Şirvani ilə XX əsr inqilabi satiranın banisi M. Ə. Sabir arasında ədəbi və əbədi uçurulmaz körpü var.
4. S. Ə. Şirvani satiraları XX əsr satirik şeirin ideya-bədii əsasıdır.
5. Şair multikultural, tolerant sənətkardır.

**Ədəbiyyat**


1. Köçərli, F. (2005). *Azərbaycan ədəbiyyatı.* Avrasiya Press.
2. Qasımzadə, F. (2017). *XIX əsr Azərbaycan ədəbiyyatı.* Elm və təhsil.
3. Quliyeva, S. (2021). *Azərbaycan ədəbiyyatında multikulturalizmin bədii inikası.* Elm.
4. Mirzə Ələkbər Sabir. (2012). *Hop-hopnamə*. Təhsil.
5. Şirvani, S. Ə. (2005). *Seçilmiş əsərləri* (3 cilddə). I cild. Avrasiya Press.
6. Şirvani, S. Ə. (2005). *Seçilmiş əsərləri* (3 cilddə). II cild. Avrasiya Press.
7. Şirvani, S. Ə. (2005). *Seçilmiş əsərləri* (3 cilddə). III cild. Avrasiya Press.
8. Vazeh, M. Ş. (2004). *Nəğmələr*. Şərq-Qərb.
9. *XIX əsr Azərbaycan ədəbiyyatı tarixi.* (1966). Azərbaycan SSR. EA.
10. *Knizhnoye obozreniye*. (1999).
11. *Sbornik materialov dlya opisaniya mestnosti plemen Kavkaza*. (1890). Devyatyy vypusk.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 76–85
https://doi.org/10.48445/i5328-2212-5644-l

# Tədris prosesində müəllimin nitq mədəniyyətinin psixoloji əhəmiyyəti

***Gülnarə Əlixanova*** [1]

**XÜLASƏ**

*Təsadüfi deyil ki, əsrlər boyu insanın nitq mədəniyyətinə daima diqqət yetirilmişdir, çünki nitq birbaşa erudisiyaya, zəkaya, etikaya və tərbiyəyə işarə edir. Düzgün nitq mədəniyyətinə yiyələnmək cəmiyyətdə müvəffəqiyyət, nüfuz, perspektiv və karyerada irəliləyiş əldə edərək uğur qazanmağın göstəricisidir. Hər bir şəxs cəmiyyətin qəbul etdiyi düzgün nitq mədəniyyətinə yiyələnməlidir. Müəllimlik peşəsinin spesifikliyi dedikdə, onun əhatəsindəki digər insanlarla daimi təmasda olması nəzərdə tutulur. Müəllimin fəaliyyəti şagird şəxsiyyətinin formalaşmasına, şagirdin cəmiyyət tərəfindən tələb olunan müəyyən davranış qaydalarının mənimsənilməsinə və eyni zamanda intellektual inkişafına yönəldilmişdir. Deməli, müəllim təkcə psixoloji və xüsusi biliklərə deyil, eyni zamanda peşəkar qarşılıqlı ünsiyyət bacarıqlarına da malik olmalıdır. Nitq mədəniyyəti dilin tələffüz normalarına, vurğu və sözdən istifadə qaydalarına yiyələnmək, o cümlədən müxtəlif ünsiyyət şəraitində ifadəli dil vasitələrindən öz məqsəd və məzmununa uyğun istifadə etmək bacarığıdır. Düzgün nitq, dil mədəniyyətinin təməlidir. Müasir insanın lüğət ehtiyatı müxtəlif məlumat mənbələrindən, o cümlədən internet vasitəsilə dilimizə daxil olan çox sayda alınma sözlərdən ibarətdir. Son zamanlar internet ünsiyyəti gənclərin nitqinə təsir edərək həlli tələb edilən mühüm problemə çevrilmişdir.*

**AÇAR SÖZLƏR**

*ünsiyyət bacarıqları, etika, nitq mədəniyyəti, müəllim, ünsiyyət*

**MƏQALƏ TARİXÇƏSİ**

Göndərilib: 10.03.2025
Qəbul edilib: 07.05.2025

[1] Psixologiya üzrə fəlsəfə doktoru, baş müəllim, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. https://orcid.org/0000-0002-5241-0250 | gülnare.alixanova@mail.ru

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 76–85
https://doi.org/10.48445/i5328-2212-5644-l

# Teacher's Speech Culture in the Teaching Process Psychological Significance

***Gulnara Alikhanova*** [1]

**ABSTRACT**
*It is no coincidence that throughout the centuries, attention has been paid to the culture of human speech, because speech directly points to erudition, intelligence, ethics and education. Mastering the correct speech culture is an indicator of achieving success in society, reputation, perspective and career advancement. Each person should acquire the correct speech culture accepted by the society. The specificity of the teaching profession means constant contact with other people around him. The activity of the teacher is aimed at the formation of the student's personality, the assimilation of certain rules of behavior required by the society and at the same time intellectual development of the student. Therefore, a teacher should have not only psychological and special knowledge, but also professional interpersonal communication skills. Speech culture is the ability to master the pronunciation norms of the language, the rules of accent and word usage, including the ability to use expressive language tools in accordance with their purpose and content in various communication situations. Correct speech is the basis of language culture. The vocabulary of a modern person consists of a large number of borrowed words that enter our language through various sources of information, including the Internet. Recently, Internet communication has become an important problem that needs to be solved, affecting the speech of young people.*

**KEYWORDS**
*communication skills, ethics, speech culture, teacher, communication*

**ARTICLE HISTORY**
Received: 10.03.2025
Accepted: 07.05.2025

---

[1] Doctor of Philosophy in Psychology, Senior Lecturer, Azerbaijan State Pedagogical University. Azerbaijan. https://orcid.org/0000-0002-5241-0250 | gülnare.alixanova@mail.ru

## Giriş

Pedaqoji psixologiyada müəllimin sosial rolunu, onun cəmiyyətdəki yerini və funksiyalarını ifadə edən xüsusi bölmə “Müəllim psixologiyası” adlanır. Müvafiq olaraq, peşə-pedaqoji hazırlıq və müəllimin özünütəkmilləşdirmə prosesi pedaqoji psixologiyanın aparıcı problemlərindən biri hesab olunur. Pedaqoji elmlərdə müəllimin təhsil və tərbiyə prosesindəki mühüm, müəyyənedici rolu ilə bağlı mövqeyi hamı tərəfindən qəbul edilir.

Müəllim şagirddə mədəniyyət anlayışını, o cümlədən nitq mədəniyyətini inkişaf etdirən bir mütəxəssisdir. Müəllimin nitq mədəniyyəti həm də onun mənəvi simasını formalaşdıran hər bir şəxsiyyətin mədəniyyətidir. Müəllimlik peşəsi bir çox xüsusiyyətləri özündə birləşdirsə də, onların içində əsas yeri nitq mədəniyyəti tutur. Əgər müəllim nitq mədəniyyətinə, peşəkar bilik və bacarıqlara malikdirsə, o zaman onun şagirdləri, şübhəsiz ki, təlim prosesində səmərəli uğurlar əldə edəcəklər (Əlizadə, 2010, s. 29).

***Məqalənin mövzusunu*** *tədris prosesində müəllimin nümayiş etdirdiyi nitq mədəniyyətinin psixoloji əhəmiyyətə malik olması təşkil edir.*

***Məqalənin aktuallığı*** *müəllimlərin pedaqoji prosesdə nitqdən düzgün istifadə xüsusiyyətlərinin əsas təzahürlərini müəyyənləşdirmək, müasir pedaqoji psixologiyanın elmi-nəzəri tələbləri səviyyəsində həmin problemlərin təhlilini verməkdən ibarətdir.*

***Məqalənin məqsədi*** *müəllimlərin dərs prosesində nitqdən istifadə prosedurlarının səmərəli şəkildə həyata keçirilmə probleminin təhlili yollarını müəyyənləşdirməkdən ibarətdir.*

***Məqalənin elmi əhəmiyyəti və yeniliyi*** *elmi yaradıcılıq işində bu mövzu ilə maraqlananlar, eləcə də ali və orta ixtisas məktəblərinin tələbə və magistrləri, psixoloq və pedaqoqlar istifadə edə bilməsi ilə bağlıdır.*

## Metodlar

Müəllimin peşə-pedaqoji fəaliyyətinin 80 %-i canlı şifahi nitq formasında həyata keçirildiyi üçün şifahi izahın çap olunmuş sözlə və yazılı sözlə müqayisədə rolu çox böyükdür. Şifahi nitq çap olunmuş və ya yazılı mətnlə müqayisədə insanı daha çox təsirləndirir, həyəcanlandırır və ovsunlayır.

Gənc müəllim şagirdlər, onların valideynləri, ailə üzvləri və həmkarları ilə peşəkar şifahi ünsiyyətdə olmalıdır. Bu, “pedaqoji ifadə”, intonasiya, məntiqi vurğu,

pauzalar və s. vasitələrdən optimal istifadə ilə yerinə yetirilir. Şifahi nitq müəyyən akustik xüsusiyyətlərə: nitqin sürətinə, həcminə, tembrinə, intonasiyasına, yayılmasına və diksiyaya malikdir.

Müəllim dərs prosesində optimal nitq sürətini inkişaf etdirməyi qarşısına mühüm bir məqsəd kimi qoymalıdır. Əgər müəllim sürətli danışarsa, bu zaman şagirdlər üçün verilən məlumatın məzmununu dərk etmək kifayət qədər çətinləşər. Eyni zamanda nitqin həddən yavaş səsləndirilməsi də şagirdlərdə yorğunluğun əmələ gəlməsinə səbəb olar (Əlizadə, 2004, s. 20–21).

Danışıq tempini idarə etmək müəllimdən mühüm bacarıq tələb edir. Müəllim qarşılıqlı ünsiyyət üçün kifayət qədər rahat olan səs sürəti seçməlidir. Məsələn, nitqin tempini onun məzmunu ilə əlaqələndirməyi; çatdırılan məlumatın əhəmiyyətindən asılı olaraq sürəti dəyişdirməyi və s. bacarmalıdır. Müəllimin nitqinin ifadəliliyini şərtləndirən digər amil isə səsin ifadəlilik dinamikası və onun gücünü dəyişmək qabiliyyətidir. Pedaqoji səsin imkanlarını təkmilləşdirmək üçün aşağıdakı xüsusi məşqləri yerinə yetirmək tövsiyə olunur: Əvvəlcə bütün səsləri aydın şəkildə tələffüz edərək yavaş-yavaş dilin ifadə qabiliyyətinə fikir vermək, sonra isə oxunu sürətləndirmək lazımdır. Pedaqoq bu zaman öz nitqinin ifadə tələffüzünün aydınlığına mütləq nəzarət etməlidir.

Səsin tonu səs aparatının fəaliyyəti nəticəsində yaranan səs intensivliyinin (gücünün) subyektiv eşitmə hissidir. Səsdən peşəkar istifadə etməyə nəzarət dedikdə, pedaqoji ünsiyyətdə müxtəlif səs səviyyələrinin və geniş dinamik diapazondan istifadə nəzərdə tutulur. Müəllim əksər hallarda asta və ya yüksək səslə danışmasa da, səsin “təhlükəsizlik ehtiyatlarına” diqqət etməlidir. Bəzən yüksək səs tonu ilə danışmaq lazım gəlir. Bu zaman müəllim səsini itirmək təhlükəsi ilə də üzləşə bilər.

Ümumiyyətlə, istifadə olunan səs tembri, əsasən, əhəmiyyətli bir akustik xüsusiyyət kimi çıxış edir. O, səsin spesifik koloriti kimi qəbul edilir ki, bu da insanları (onları görmədən) səslərinə görə ayırmağa geniş imkan verir. Prosesdə səslərin ifadə ahəngliliyi, həcmi və müddəti eyni olsa belə, bu mümkün olur. Tembr çox mühüm kommunikativ əhəmiyyətə malikdir. Məsələn, natiq xoş, gözəl səs tembrinə malik olarsa, həmsöhbəti ilə və ya çıxış edəcəyi auditoriya ilə əlaqə qurmağı kifayət qədər asan olacaqdır (Əzimli, 2008, s. 87–89).

Müəllimin nitq mədəniyyətinin ən mühüm elementinin əsasını *intonasiya* təşkil edir. İntonasiya dedikdə, “nitqi fonetik cəhətdən təşkil edən və müxtəlif,
o cümlədən sintaktik, ifadəli, emosional mənaların ifadəetmə vasitəsi olan nitqin akustik elementlərinin (melodiya, ritm, temp, intensivlik, vurğu quruluşu, tembr və

s.) məcmusu başa düşülür. İntonasiya şagirdlərin hisslərinə təsir edir, müəllimin sözlərinə çalar qatır, onları müəyyən detallara daha çox diqqət yetirməyə məcbur edir. Düzgün intonasiyanın formalaşması üçün keçirilən məşqlərdə, əsasən, səs tonunu dəyişdirməklə müxtəlif nağılların səhnələşdirilməsi zamanı heyvan rollarını canavar kimi kobud, tülkü kimi eyhamla canlandırmaq mümkündür.

Müəllimin səs zənginliyi minimum səy ilə səsinin uzaq məsafədən eşidilməsi qabiliyyətidir; həm danışan, həm də dinləyən daha müsbət bir səs təəssüratı hiss edir – sanki "pərvazlanır".

Nitq texnikasının vacib elementlərindən biri də *diksiyadır*. Diksiya, əsasən, aşağıdakıları özündə ehtiva edir:

1) tələffüz, sözlərin deyiliş tərzi;

2) nitqin anlaşıqlığı, səslərin, hecaların və sözlərin aydın tələffüzü.

Psixoloji-pedaqoji bilik sahəsində müəllim hazırlığı, əsasən, mühüm pedaqoji funksiyalarla, həyata keçirdiyi hərəkətlərlə (bacarıqlarla) və qabiliyyətlərlə tanış etmək baxımından nəzərdən keçirilir. N. V. Kuzmina, A. İ. Şerbakov və digər tədqiqatçılar müəllim şəxsiyyətinə aid olan tələb və əsas funksiyaları (konstruktiv, təşkilati, kommunikativ, qnostik) tədqiq etmişlər. Müəllimlərin peşə-pedaqoji hazırlığının həyata keçirilməsi və onların səlis nitq mədəniyyətinə malik olması özünüinkişafetdirmə planlarında xüsusi yer tutur (Vvedenskaya, 2001, s. 112).

Müəllimin səlis diksiyaya malik olması xüsusilə vacibdir, çünki onun nitqi şagirdləri tərəfindən bir nümunə kimi qavranılır. Bununla əlaqədar təlimlər müstəqil şəkildə və ya nitq texnikası mütəxəssisinin rəhbərliyi altında yerinə yetirilsə, sözlərin son hissəciklərinin tələffüzü zamanı ehtiyatsızlıq (şəkilçiləri udmaq) və narahatlıq aradan qaldırıla bilər.

Şagirdlərlə şifahi ünsiyyət zamanı tələb olunan *fasilələrə* (pauzalara) riayət etmək vacibdir. Fasilə müxtəlif səbəblərdən yaranan və müxtəlif funksiyaları yerinə yetirən nitq axınını pozmağa yönələn səsin müvəqqəti kəsilməsidir. Şifahi nitqdə fasilədən düzgün istifadə sözün və ifadənin mənasını daha dolğun çatdırmağa imkan verir, yazıda isə onlar durğu işarələri ilə qeyd olunur. Fasilədən səmərəli istifadə etməklə kiçik yaşlı şagirdlərdə mövzuya daha böyük maraq yaratmaq mümkündür. Bundan əlavə, fasilələr şagirdlərin eşitdiklərinə göstərdiyi reaksiyaları izləmək imkanı yaradır.

Nitqin düzgünlüyü nitqin strukturunun dilin qüvvədə olan normalarına mükəmməl uyğunluğudur: tələffüz (orfoepik), aksentoloji, leksik, qrammatik (mor-

foloji), sintaktik, qrafik, durğu işarələri, xəttatlıq və üslubi normalar (Əzimli, 2008, s. 103).

Nitqin saflığı ədəbi dilə yad olan söz və ifadələrin daxil olmaması ilə əks olunur. Tədqiqatçılar nitqi korlaya bilən aşağıdakı elementləri müəyyən etmişlər:

1) dialekt sözlər (xalqın ümumi dilinə deyil, yerli dialektlərə xas olan sözlər);
2) peşəkar sözlər;
3) nitq vurğuları, dəftərxanaya aid "kargüzarlıq" sənədlərində istifadə olunan sözlər, ifadələr və cümlələr;
4) jarqon ifadələr, yəni jarqon ifadələrdə yaranan və istifadə olunan sözlər, həmçinin şifahi ifadələr – xalq dilinin dar qrup çərçivəsində "təzahürləri";
5) nitqi korlayan sözlər və ifadələr;
6) əxlaq normalarının tələbatlarına cavab verməyən dil elementləri (vulqar sözlər – hər hansı obyekt və ya hadisələri təqribən ifadə edən sözlər);
7) alınma sözlər.

Bəzən kütləvi çıxışlarda tələffüz səhvləri artıq nitq normasına çevrilir. Məktəb psixoloqu tərəfindən sinif müəlliminin iştirakı ilə "anket-sorğu" metodu vasitəsilə məktəb şagirdlərinin ədəbi əsərlərdə və mediada bu cür ifadələrdən istifadə problemini izləmək mümkündür. Sorğu sualları təxmini olaraq bu cür tərtib oluna bilər:

1. Ailə üzvləriniz ünsiyyət qurarkən nitqlərində tələffüz səhvləri olan sözlərdən istifadə edirlərmi? (bəli; xeyr)
2. Nitqinizdə tələffüz səhvləri olan ifadələr varmı? (bəli; xeyr)
3. Əgər varsa, onlardan nə dərəcədə tez-tez istifadə edirsiniz? (tez-tez; nadir hallarda)
4. Bununla bağlı problem görürsünüzmü? (bəli; xeyr) və s.

Nitqin zənginliyi onun müxtəlif dil vasitələrinin istifadəsi ilə ifadə olunur. Leksik və lüğət zənginliyi nitqdə fəal lüğət ehtiyatının istifadəsində özünü göstərir. Nitqin semantik zənginliyi həm də lüğətlə bağlıdır. Sözlərin semantikasının (linqvistik mənası) yenilənməsi prosesi lüğətin zənginləşdirilməsinin daimi mənbəyidir, bunun sayəsində nitq obrazlılıq və ifadəlilik keyfiyyəti əldə edir. Nitqin zənginliyini inkişaf etdirmək üçün aşağıdakı məşqlərdən istifadə edilir:

1. Mövzu ilə bağlı verilmiş sözləri qruplaşdırmaq: *məktəb, universitet, yeməkxana, mağaza, teatr* və s.
2. Sözlərin leksik mənalarını göstərmək: *söz oyunu, çərçivə, kateqoriya* və s.

Müəllim həm də nitqin funksional keyfiyyətlərini – dəqiqlik, məntiqlilik, aydınlıq, əlçatanlıq, aktuallıq, təsirlilik, ifadəlilik və s. mənimsəməlidir. Nitqin ifadəliliyi onun məzmununu şifahi nitqdən istifadə etməklə çatdırmaq bacarığıdır. Dinləyicilərin diqqətini cəlb etmək üçün istifadə olunan üsullardan asılı olaraq tələffüz, aksentologiya, leksik, intonasiya və üslub (və ya stilistik) ifadəliliyini fərqləndirirlər. Bu keyfiyyət danışanın təfəkkürünün müstəqilliyindən və öz dediklərinə marağından asılı olur. İfadəli nitqin formalaşmasında natiqin dil biliklərinə; dil üslublarının xassələrinə və xüsusiyyətlərinə; dilin ifadə imkanlarına, nitq bacarıqlarına malik olması çox mühüm rol oynayır (Davydov, 2004, s. 39).

Nitqin dəqiqliyi nitqi məzmun baxımından xarakterizə edən linqvistik keyfiyyətdir. Bu, nitq məzmununu bilmək və onu şifahi ifadə etmək bacarığı ilə əldə edilir.

Məntiqlilik dedikdə, aydın, dəqiq və ardıcıl ifadə tərzi nəzərdə tutulur. İfadəlilik tərzi dəyişməz qalmalıdır. Bir-birinə zidd olan iki ifadə eyni vaxtda doğru ola bilməz. Məntiqliliyi dəqiqləşdirmək üçün şagirdlərə hər hansı bir məntiqi mətn təqdim olunduqda aşağıdakı təlimatdan istifadə edilir:

"Mətni oxuyun. Onun məntiqini nə təmin edir? Mətndəki mülahizələrdə məntiqi əlaqə özünü necə təzahür etdirir?"

## Nəticələr

Qədim dövrlərdən bəri nitq bacarığına malik olmaq, şəxsiyyətin mühüm üstünlüklərindən hesab olunurdu. Yaxşı nitq, ilk növbədə, uşaqları öyrətmək və tərbiyə etmək üçün ən mühüm vasitə olan müəllimin, o cümlədən də hər bir insanın təfəkkürünün, ümumi mədəniyyətinin, erudisiyasının göstəricisidir. T.A.Ladıjenskaya qeyd edirdi ki, şifahi nitqi "onun planlaşdırma, idrak və təsir funksiyası" ilə mənimsəməyi öyrənmək – "ümumiyyətlə, öyrənmənin ən vacib peşəkar bacarığına yiyələnməyi öyrənmək" deməkdir.

Araşdırmalardan məlum olur ki, müəllimdə natiqlik qabiliyyəti və təbiilik kimi keyfiyyətlərə olan ehtiyac xüsusilə önəmlidir. Eyni zamanda şagirdlərin psixi vəziyyətini anlamaq, empatiya və sosial qarşılıqlı əlaqəyə təlabat kimi keyfiyyətlər də çox vacibdir.

Müəllimin dərs prosesi zamanı ifadə etdiyi sözlərdə aydınlıq tərəfindən səslərin düzgün və dəqiq artikulyasiyası yerinə yetirilməlidir.

Fikirlərin aydın ifadə edilməsi mövzunun tam aydın başa düşməsi zamanı təzahür edir.

Dərs fəaliyyəti prosesində, xüsusən də ikimənalı ifadələrdən istifadə olunması müəllim nitqinin aydınlığına müəyyən qədər xələl gətirməsi problemi diqqət mərkəzində saxlanılır.

Hər bir müəllim öz şəxsi nitq bacarıqlarını daim təkmilləşdirməli, nitqinə mütəmadi olaraq nəzarət etməli və bunun üçün nitq xətalarının tipologiyasını yaxşı bilməlidir.

Gənc müəllimlərin peşə fəaliyyətində də nitq mədəniyyəti aparıcı rola malikdir. Müəllimin nitq mədəniyyəti pedaqoji ustalığın tərkib hissələrindən biri olduğundan bu keyfiyyətin formalaşması, inkişafı və təkmilləşməsi prosesi bu günün ən vacib vəzifələrindən biridir.

Müəllim gənc nəsildə doğma dilə, mədəniyyətə maraq yaratmanın, məhəbbət və ehtiramın tərbiyə edilməsinin fəal iştirakçısı olduğu üçün şagirdlərin təhsilinin mükəmməl inkişafına öz əməli töhfəsini verməlidir.

## Müzakirə

Müasir müəllimin qarşısında mühüm vəzifələr durur. Onları yerinə yetirmək üçün yalnız pedaqoji biliklər kifayət etmir; müəllimin köməyinə pedaqoji psixologiya və psixopedaqogika gəlir. Müəllimin kifayət qədər psixoloji biliklərə malik olması da əsas şərtlərdən biri hesab olunur. Psixoloji biliklər müəllimi şagirdlərə daha da yaxınlaşdırır və pedaqoji prosesin rəngarəng, səmərəli və məzmunlu olmasına təsir göstərir. Elə buna görə də müəllimin psixoloji biliklərə yiyələnməsi və gözəl nitq qabiliyyətinə malik olmasının vacibliyi hər zaman vurğulanmış və buna böyük əhəmiyyət verilmişdir.

Tanınmış pedaqoq K. D. Uşinski müəllim qarşısında pedaqogika ilə yanaşı, psixologiya elmini də dərindən bilməsinin zəruri olduğunu qeyd etməklə, bu məsələnin daha böyük əhəmiyyət kəsb etdiyini vurğulayır (İlyasov, 2018, s. 158−160).

Müəllim, şəxsi nümunəsi ilə şagird və tələbələrində Azərbaycan Respublikasının Konstitusiyası və onun qanunlarına, dövlət rəmzlərinə, Azərbaycan xalqının tarixinə, mədəniyyətinə, dilinə, adət-ənənələrinə, milli və ümumbəşəri dəyərlərə, cəmiyyətə, ətraf mühitə dərin hörmət və qayğı hissi aşılayır.

N.Tusi müəllimlərin tərbiyə işində rolunu "Əxlaqi-Nasiri" əsərində yüksək qiymətləndirir, onların yüksək təhsilli, elmli, əxlaqlı, tələbkar, mərhəmətli, səlis nitqə malik və ehtiramlı olmasını vacib hesab edirdi(Nəsrəddin Tusi, 2005, s.85–87).

Tanınmış filosoflar Aristotel, Konfutsi, Əbu Nəsr Məhəmməd Əl-Fərabi, İbn Sina, Nizami Gəncəvi, Cəlaləddin Rumi, Əvhədi Marağalı və digər görkəmli mütəfəkkirlər məhz müəllim kimi yüksək nitq mədəniyyətləri ilə seçilmişlər.

İ. H. Pestalossi, L. N. Tolstoy, Y. Korçak, V. A. Suxomlinski, M. T. Sidqi, F.Köçərli, Ü. Hacıbəyov, A. Şaiq, M. Ə. Sabir, M. F. Axundov və digər görkəmli şəxsiyyətlər məhz müasirlərimiz olan yüzlərlə ustad müəllimlərin sənətdəki uğur və müvəffəqiyyətləri ilə tanınmışlar (Əlixanova, 2022, s. 264).

Pedaqoq P. F. Kapterev əsərlərində müəllimin "xüsusi müəllimlik keyfiyyətləri"ni xüsusilə vurğulamışdır. O, "müəllimin elmi hazırlığı" və "şəxsi müəllimlik istedadı"nı bununla əlaqələndirir, müəllimin nitq mədəniyyətinin nəzakət, düzgünlük və intizamlılıq kimi etiket normaları ilə birbaşa qarşılıqlı əlaqədə olduğunu qeyd edirdi: "Müəllimdə ədəb və əxlaq elə birləşməlidir ki, onları bir-birindən ayırmaq belə çətin olsun. Bunlar insanlarda xeyirxahlıq və hörmət kimi əxlaq normalarına əsaslanır. Xoşməramlılıq da öz növbəsində humanizmin təzahür formalarından biri hesab edilir" (Vvedenskaya, 2001, s. 45).

Nəzakətlilik, ilk növbədə, ümumi qəbul edilmiş ədəb qaydalarına riayət etmək, konkret vəziyyətə uyğun olaraq (işdə, evdə, ziyarətdə, ictimai yerlərdə və s.) nümayiş etdirilən davranış bacarığıdır. Düzgünlük nəzakətliliyə yaxın bir anlayışdır. Onun mənası, başqa bir insanın ləyaqət və qüruruna toxunmadan hər hansı bir həyati vəziyyətdə özünü ədəb çərçivəsinə uyğun saxlaya bilmək bacarığındadır.

**Nəticə**

Nəzakətlilik insanlara (iş fəaliyyətində, işgüzarlıq şəraitində, şəxsi münasibətlərdə, ictimai yerlərdə və s.) yönəldilən münasibətlərdə tələb olunan hədləri müşahidə etmək bacarığını ehtiva edir. Həmin hədlərin pozulması isə, nəticədə, narazılıq və nifrətə səbəb olur. Davranışında nəzakət nümayiş etdirən insan, ünsiyyət ortağının fərdi xüsusiyyətlərini, onun psixoloji vəziyyətini, əhvali-ruhiyyəsini nəzərə alaraq, təkcə sözünün məzmununa deyil, həm də formasına diqqət yetirməyə çalışır (Klimova, 2001, s. 67−69).

Müəllimin nitqi təlim fəaliyyətində pedaqoji təsirin əsas vasitəsi və eyni zamanda şagirdlər üçün nümunədir. Pedaqoji fəaliyyət prosesində nitqin formasına, onun normativ xarakterinə xüsusi diqqət yetirilməlidir ki, nitq təkcə qavrama üçün deyil, həm də müəyyən dərəcədə təqlid üçün də əlçatan olsun. Ona görə də təhsil müəssisələrində dilin düzgün inkişafına və nitq mədəniyyətinin təkmilləşdirilməsinə xüsusi diqqət yetirilməlidir.

**Ədəbiyyat**


1. Əlizadə, Ə. Ə. (2004). *Müasir Azərbaycan məktəbinin psixoloji problemləri*. Pedaqogika.
2. Əlizadə, Ə. Ə. (2010). *Pedaqoji psixologiya.* I – II kitab. ADPU.
3. Əlixanova, G. H. (2022). *Müəllim şəxsiyyəti gənc nəslin tərbiyəsində ən mühüm amil kimi*. SDU. Konfrans materiallar, 4, 263–267.
4. Əzimli, Q. (2008). *Yaş və pedaqoji psixologiyanın müasir problemləri: Ali məktəblər üçün tədris vəsaiti*. Nurlan.
5. İlyasov, M. İ. (2018). *Müəllim peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri*. Monoqrafiya. Elm və təhsil.
6. Nəsrəddin Tusi. (2005). *Əxlaqi – Nasiri*. Lider Nəşriyyatı.
7. Seyidov, S. İ., Həmzəyev, M. Ə. (elmi red.). (2007). *Psixologiya*. Nurlan.
8. Davydov, V. V. (2004). *Problemy razvivayushchego obucheniya*. Akademiya.
9. Klimova, T. Y. (2001). *Razvitiye nauchno-issledovatel'skoy kul'tury uchitelya* (dis. d-ra ped. nauk).
10. Vvedenskaya, L. A. (2001). *Kul'tura rechi: uchebnik*. Feniks.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 86–95
https://doi.org/10.48445/o5639-8545-9931-l

# Mirzə Ələkbər Sabir ustadı Seyid Əzim Şirvani ədəbi məktəbinin nümayəndəsi kimi

***Ulduz Qəhrəmanova*** [1]

**XÜLASƏ**
*Mirzə Ələkbər Sabir yaratdığı satirik tiplərin öz dilləri ilə özlərini ifşa etmək üsulunu seçərkən sələflərindən, klassik sənətkarlardan bəhrələnmişdir. O, M. F. Axundzadə və S. Ə. Şirvaninin təcrübələrinə əsaslanaraq, elmi ədəbiyyatda da göstərildiyi kimi, yaradıcılığının bütün məqamlarında, o cümlədən klassik irsdən bəhrələndiyi zaman heç vaxt təkrarçılığa, təqlidə yol verməmiş, daim orijinal yazı tərzi nümayiş etdirmişdir. Sabirin klassik irsdən bəhrələnməsi və onlardan istifadə üsulları müxtəlifdir. O, ustadların poetik deyim tərzlərini, təsvir və ifadə üsullarını zamana uyğunlaşdırır, müəllif mövqeyində dəyişiklik edir, lirik qəhrəmanları gah fədakar insanlara, gah da satirik tiplərə çevirirdi. Qəhrəmanın "məşuq"u, "sevgili"si mahiyyətcə dəyişdirilir, lirik dialoq və monoloqlar satirik və yumoristik şəklə salınır, bəzi hallarda şikayət, giley-güzar yeni "aşiq"in fədakarlığının təsdiqinə yox, onun daxili eybəcərliyinin ifşasına və ya ətalətinin tənqidinə xidmət edir. Bütün bu çoxçalarlı təsvir və bədii təqdimat üsulları nəticəsində Sabirin surətlər aləminin zənginliyi təmin edilmiş olur.*

**AÇAR SÖZLƏR**
*satira, ustad, novator, klassik irs, satirik tip*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 18.04.2025
Qəbul edilib: 07.05.2025

---

[1] Filologiya üzrə fəlsəfə doktoru, baş müəllim, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. https://orcid.org/0009-0003-4418-9319 | ulduzkahraman1@gmail.com

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 86–95
https://doi.org/10.48445/o5639-8545-9931-l

# Mirza Alakbar Sabir as a Representative of His Master Seyid Azim Shirvani Literary School

***Ulduz Gahramanova*** [1]

**ABSTRACT**
*Mirza Alakbar Sabir benefited from his predecessors, classical artists, while choosing the method of exposing the satirical type with his own words. He relied on the experiences of M. F. Akhundzade and S. A. Shirvani. However, as it is shown in scientific literature, in all aspects of his creativity, including when he benefited from the classical heritage, Sabir always demonstrated an original style of writing, never allowing repetition or imitation. Sabir's use of classical heritage and the methods of using them are very diverse; he adapts the poetic idioms, description and expression methods of the masters to the times, changes the position of the author, sometimes the lyrical heroes become selfless people and sometimes satirical types, the "lover" and "beloved" of the hero are essentially changed, the lyrical dialogue and monologues become satirical and is put into a humorous form, in some cases, complaints and complaints serve not to confirm the dedication of the new "lover", but to expose his inner ugliness or criticize his inertia. As a result of all these multi-hued images and artistic presentation methods, the richness of the world of Sabir's paintings is ensured.*

**KEYWORDS**
*satire, master, innovator, classical heritage, satirical type*

**ARTICLE HISTORY**
Received: 18.04.2025
Accepted: 07.05.2025

[1] Doctor of Philosophy in Philology, Head Teacher, Azerbaijan State Pedagogical University. Azerbaijan. https://orcid.org/0009-0003-4418-9319 | ulduzkahraman1@gmail.com

 

## Giriş

M. Ə. Sabirin klassik irsdən bəhrələnməsi, onlardan istifadə üsulları müxtəlifdir; o, ustadların poetik deyim tərzlərini, təsvir və ifadə üsullarını zamana uyğunlaşdırır, müəllif mövqeyində dəyişiklik edir. Lirik qəhrəmanlar gah fədakar insanlara, gah da satirik tiplərə çevrilir, qəhrəmanın "məşuq"u, "sevgili"si mahiyyətcə dəyişdirilir, lirik dialoq və monoloqlar satirik və yumoristik şəklə salınır, bəzi hallarda şikayət və giley-güzar yeni "aşiq"in fədakarlığının təsdiqinə yox, onun daxili eybəcərliyinin ifşasına və ya ətalətinin tənqidinə xidmət edir. Bütün bu çoxçalarlı təsvir və bədii təqdimat üsulları nəticəsində Sabirin surətlər aləminin zənginliyi təmin edilmiş olur.

## Metodlar

Məqalədə qarşıya qoyulan məqsədlərin gerçəkləşdirilməsi praktik materialın təhlilinə əsaslanır. Belə ki, məqalədə Mirzə Ələkbər Sabirin Seyid Əzim Şirvani irsindən bəhrələnməsi üsulları təhlil olunaraq hər iki sənətkarın yaradıcılıq fərdiliyi üzə çıxarılmağa çalışılmışdır. Hər iki sənətkarın yaradıcılığı müqayisə edilərək Sabirin Şirvani ənənəsindən necə bəhrələnərək novatorluğunu ortaya qoyulması probleminə aydınlıq gətirilmişdir. Bunun üçün müqayisəli metoddan, tarixi-müqayisəli yanaşma üsulundan istifadə olunmuşdur. Müəllif bu yanaşma üsulundan istifadə etməklə M. Ə. Sabirin öz ustadının (S. Ə. Şirvaninin − U. Q.) keçmiş qəhrəmanını təkcə yeni tərzdə, yeni ruhda danışdırmır, eyni zamanda onun yaratdığı tipin öz danışığı ilə özünü ifşa etmək üsulunu göstərir.

## Nəticələr

− M. Ə. Sabir öz ustadının (Seyid Əzim Şirvaninin) keçmiş qəhrəmanını təkcə yeni tərzdə, yeni ruhda danışdırmaması, eyni zamanda onun yaratdığı tipin öz danışığı ilə özünü necə ifşa etmək üsulu araşdırılmışdır.

− Çoxçalarlı təsvir və bədii təqdimat üsulları nəticəsində Sabirin surətlər aləminin zənginliyinin necə təmin edilməsi müəyyənləşdirilmişdir.

− M. Ə. Sabirin Seyid Əzim Şirvani irsindən bəhrələnməsi, ondan istifadə üsullarının müxtəlifliyinə aydınlıq gətirilmişdir.

− Sabirin Seyid Əzim Şirvaninin poetik deyim tərzlərini, təsvir və ifadə üsullarını zamana uyğunlaşdırması, müəllif mövqeyində dəyişiklik etməsi təhlil edilmişdir.

**Müzakirə**

– M. Ə. Sabirin öz ustadının əsərindən formanı götürsə də, onun qəhrəmanını, dövrə, zamana uyğun olaraq, tamamilə yeni tarixi-ictimai şəraitdə təsvir və təqdim etməsi təsdiq edilmişdir.

– M. Ə. Sabirin S. Ə. Şirvaninin təcrübələrinə əsaslanaraq elmi ədəbiyyatda da göstərildiyi kimi, yaradıcılığının bütün məqamlarında, o cümlədən klassik irsdən bəhrələndiyi zaman heç vaxt təkrarçılığa, təqlidə yol verməməsi, daim orijinal yazı tərzi nümayiş etdirməsi təsdiq edilmişdir.

– M. Ə. Sabirin Seyid Əzimin qəzəlinin vəzninə, ahənginə və rədifinə uyğun olaraq yazılmış cavab satiraları təhlil müstəvisinə gətirilmişdir.

Sabirşünas alim, professor A. Bayramoğlu, görünür, məhz bu keyfiyyəti nəzərdə tutduğu üçün Sabirin ədəbi qəhrəmanlarının və satirik tiplərinin sayının onun əsərlərinin sayından çox olduğunu bildirərək yazır: "Sabirin satirik ifşa üsulları dialoqlarla, qarşı tərəfə müraciət şəklində giley-güzarla, bəzən öyüd-nəsihətlə olur. Müşahidələr göstərir ki, bu üsulların da hər birini tipin xarakteri, mövzuya uyğun seçilən fikrin ifadə forması müəyyənləşdirir. Məsələn: "Əhvalpürsanlıq, yaxud qonuşma" satirasındakı... baş-başa verən ictimai tiplərlə, "Bura say!" satirasındakı Zilli Soltanla camaatın dialoqunu, "Vah, bu imiş dərsi-üsuli-cədid?" – deyən köhnəlik tərəfdarı ilə "Çatlayır, Xanbacı qəmdən ürəyim" –deyə giley edən avam qadının danışığını eyniləşdirmək olmaz. Eyni zamanda "Millət necə tarac olur, olsun, nə işim var?" − deyən satirik tiplə "Mən bilməz idim bəxtdə bu nikbət olurmuş" deyənləri yan-yana qoymaq mümkün deyil. Çünki onların hər birinin öz siması, öz düşüncəsi, öz danışıq tərzi var.

Sabirin "Səttarxana" şeiri ilə Məhəmmədəli şaha həsr etdiyi "Doğrudan, Məmdəli, qeyrət həlal olsun sənə!" satirası arasındakı fərq milli azadlıq qəhrəmanı Səttarxanla despotluq nümunəsi Məhəmmədəli şahın arasındakı fərq qədərdir" (Bayramoğlu, 2001, s. 28).

Bütün bu zənginliklər təkcə həyatdan gəlmirdi. Onlara verilən yeni rənglər həm də klassik sənətkarların ədəbi irslərində əsrlərdən bəri formalaşıb gələn təsvir və təhkiyə üsulundan, obrazların daxili aləmindən qidalanırdı. Sabir sanki həyatda qarşılaşdığı ictimai tipin sosial probleminə nəzər saldıqda klassik əsər və ya onların qəhrəmanlarından biri onun gözləri qarşısında canlanırdı. Beləliklə, "köhnə" qəhrəman yeni biçimdə dilə gəlib danışırdı.

Bütün bunlar tarixiliklə novatorluğun qovuşmasına, bir-birini tamamlamasına səbəb olurdu.

“Əkinçi” qəzeti abunəçi qıtlığı problemi ilə qarşılaşanda S. Ə. Şirvani ona dəstək vermək, həmvətənlərini qəzetə abunə olmağa çağırmaq məqsədi ilə “Qəzet nədir?” adlı bir şeir yazmışdı. Həmin şeirdə qəzetin əhəmiyyətini gözdən salmağa çalışan, texnikanın inkişafının guya şeytan əməli kimi insanlara ancaq zərər vuracağını sübut etməyə səy göstərən, əslində isə, tərəqqi və inkişafın yalnız özü kimi xalqın cahilliyində mənafeyi olan zümrələrin isti aşına soyuq su tökəcəyini başa düşdüyü üçün narahatlıq keçirən tiplər tənqid atəşinə tutulmuşdur. Onlar yeniliyə, elm və texnikaya qarşı çıxırdılar.

Nəyə lazımdı bizlərə maşın,
Nə üçün xalqın aldadır başın.
Babamız görməmişdi maşın işi,
İngilis kimi tovlayır bu kişi
...Biz məgər bilmirik taxıl biçmək,
Nəyə lazımdı maşın öyrənmək.
Şuma vacibdü çünki beş cüt kəl...
Biçinə çin gərəkdi, xırmana vəl...
(Mirbağırov, 1962, s. 88).

Göründüyü kimi, bu satirik tip “Əkinçi” qəzetinin kənd təsərrüfatına, məişətin digər sahələrinə texnikanın tətbiqini, kustar üsulla məhsul becərməyin səmərəsiz olduğu fikrinə qarşı çıxıb xalqı dədə-baba qaydası ilə yaşamağa çağırır. Kamil Mir Bağırovun yazdığı kimi: “Seyid Əzimin dilləndirdiyi bu tipin danışığı, Sabirin “Nədamət və şikayət” şeirindəki avam qadının danışığını xatırladır.

...Neyliyirdim bəzəyi, ya düzəyi?
Dama-divarə yapardım təzəyi!
...Nə bilirdik nə zəhrimardı kitab?
Biz olan evdə haçan vardı kitab?
Büsbütün gül kimi insanlarıdıq,
Nə müəllim və nə dərs anlarıdıq.
(Şərif, 1962, s. 4).

Hər iki tip sanki avam bir ailədə tərbiyə almış bacı-qardaşdır” (Mirbağırov, 1962, s. 88).

Bizə belə gəlir ki, "Qəzet nədir?" şeirindəki tiplə "Nədamət və şikayət" ("Çatlayır, Xanbacı, qəmdən ürəyim") satirasının qəhrəmanı bir-birinə bənzəsələr də, eyni vəziyyətdə deyillər. Seyid Əzimin qəhrəmanı "Əkinçi" qəzetinin təbliğ etdiyi yeniliklərə qarşı çıxırsa, bu yenilik onların məişətinə daxil olmayıbsa, Sabirin qəhrəmanı artıq yeni həyat tərzinin içindədir. Ona görə də onun şikayətləri daha kəskin və yanğılıdır. Yəni bu qadın qəhrəman gəlin getdiyi ər evindəki yeni yaşam tərzi ilə heç cür barışa bilmir. Bu səbəbdən ötən günləri, ata evindəki "xoşbəxt" həyatı xatırlayır və bu həsrətlə alışıb-yanır. Buradan görünür ki, kitab, dərs, dəftər-qələm artıq cəmiyyətə daxil olmuşdur. Ona görə əsərin qəhrəmanı həmin yeniliyə qarşı çıxmaq imkanından məhrumdur. Sadəcə bu yeniliyin onun psixologiyası üçün uyğunsuzluğundan, özünün atəşə düşdüyündən, düşüncəsinə görə ağlar vəziyyətindən dad-fəryad qoparır. Sabirin qəhrəmanından fərqli olaraq, S. Ə. Şirvaninin yaratdığı obraz, qeyd etdiyimiz kimi, hələ ancaq adını eşidib, özünü görmədiyi yeniliyin qarşısını almağa çalışır.

Göründüyü kimi, M. Ə. Sabir öz ustadının əsərindən formanı götürsə də, onun qəhrəmanını, dövrə, zamana uyğun olaraq, tamamilə yeni tarixi-ictimai şəraitdə təsvir və təqdim etmişdir. Bu da, əsərin və qəhrəmanının orijinallığını və yeniliyini təmin etmişdir. Sabir öz sələfinin keçmiş qəhrəmanının yalnız danışıq tərzini, yenilik qarşısındakı sosial-psixoloji mövqeyini əsas almış, ancaq həmin qəhrəmanın xələfini tamamilə yeni biçimdə, yeni vəziyyətdə və bir qədər fərqli tərzdə təqdim etmişdir.

Fərqli tərz deyəndə, yuxarıda göstərdiyimiz kimi, Seyid Əzimin qəhrəmanından fərqli olaraq, Sabirin yaratdığı obrazın artıq yeni yaşam tərzinin içinə düşdüyünü, ər evindəki həyatı qəbul edə bilməyib çıxılmaz vəziyyətdə qalaraq nalə çəkdiyini nəzərdə tuturuq.

M. Ə. Sabir öz ustadının keçmiş qəhrəmanını təkcə yeni tərzdə, yeni ruhda danışdırmır, eyni zamanda onun yaratdığı tipin öz danışığı ilə özünü ifşa etmək üsulunu da davam və inkişaf etdirmişdir. Bu haqda Kamil Mir Bağırov yazmışdır: "Sabir Seyid Əzim yaradıcılığının şəkli xüsusiyyətlərindən də çox şey öyrənmişdir. Tənqid hədəfini öz sözləri ilə ifşa etmək xüsusiyyəti əvvəlki satirik şairlərimizdə olmamışdır. Bundan birinci dəfə Seyid Əzim istifadə etmişdir. Satira atəşinə tutulan mənfi tipin nitqi onun mənəvi aləmi haqqında aydın təsəvvür yaradır" (Mirbağırov, 1962, s. 88).

Doğrudur, tipi öz dili ilə ifşa etmək üsulu poeziyada S. Ə. Şirvaniyə aid olsa da, bədii fikirdə bu, M. F. Axundzadəyə məxsusdur. Bu məsələdən bəhs edərkən Axundov (M.F.Axundzadə – U.Q.) başlamışdı. Bu cəhətdən demək olar ki, Axundov

Sabir üçün müəyyən mənada tarixi başlanğıcdır. Sabir özünün ilk ideya-üslub təkanını məhz buradan (M. F. Axundzadədən, onun yaradıcılığından – U. Q) alır; Sabirin ilk hərəkətverici qüvvəsi məhz Axundov başlanğıcıdır. Onun xəlqiliyini, realizmini şeirdə həqiqi demokratizmə çevirən, satirik üslubunu poeziyada reallaşdıran da məhz Sabir oldu" (Hacıyev, 1980, s. 87–88).

Alim öz fikrini əsaslandırmaq üçün bildirir ki, M. F. Axundzadə ilə M. Ə. Sabir ayrı-ayrı janrlarda, yəni biri əsas etibarilə komediya və bədii nəsrdə, digəri isə poeziyada məşhur olsa da, bu onların üslub yaxınlığına mane ola bilmir. Çünki eyni, oxşar təsvir üsulunu müxtəlif janrlı əsərlərdə tətbiq etmək olar və ədəbiyyat tarixində belə hallar mövcuddur. Həmçinin eyni janrlı əsərlərdə fərqli təsvir üsulu vardır. T. Hacıyev öz fikrini belə ifadə edir: "Üslub birliyi və ya yaxınlığı üçün janr ölçü deyildir. Eyni bədii janrla müxtəlif ədəbi üslubda yazmaq mümkün olduğu kimi, müxtəlif janrda, lakin eyni üslubda yazmaq da tamamilə mümkündür və bu, geniş yayılmış haldır. Bu cəhətdən Axundovla Sabirin müxtəlif janrlarda yazması onların üslub birliyini zərrə qədər olsa da, kölgələndirə bilmir... Əgər buna qalsa, onda bir-birinə ən yaxın olan Mirzə Cəlillə Mirzə Ələkbər də üslubca başqa-başqa sənətkarlar olardılar. Halbuki mollanəsrəddinçilər özləri də müxtəlif janrlarda yazırdılar və ya əksinə, Seyid Əzim də, Zakir də satirik şeirlər yazmışlarsa da, üslubca Sabirdən ayrılırlar" (Hacıyev, 1980, s. 88).

Dilçi-alim Tofiq Hacıyev M. F. Axundzadə ilə M. Ə. Sabirin bu üslub yaxınlıqlarını onların ideya və əqidə yaxınlıqları, yaradıcılıq metodunun eyniliyi ilə əlaqələndirib göstərir ki, "ədəbi simaların yaxınlığı birinci növbədə, ideya və əqidə yaxınlığında və həyat həqiqətinə baxış meylinin (yaradıcılıq metodunun) uyğunluğundadır. Bu keyfiyyətlərin ümumiliyi göstərir ki, Sabir ideya cəhətdən olduğu kimi, üslubca da Axundovun bilavasitə varisidir" (Hacıyev, 1980, s. 88).

Akademik T. Hacıyev M. Axundzadə üslubu ilə Sabir üslubunun yaxınlığını, sələf-xələflik əlaqəsini yaratdıqları tiplərin özlərini öz danışıqları ilə ifşa etmək üsulunda görür. Bununla əlaqədar olaraq, M. F. Axundzadənin "Hekayəti-mərdi-xəsis" əsərindən Heydər bəyin monoloqunu nümunə gətirərək göstərir ki, "...Sabir satiralar ustasıdır. Lakin bu satiralarda şairin ifşa etmək istədiyi tiplər özlərini rüsvay edirlər. Şairə macal vermədən öz eyiblərini faş edirlər. Başlıca mətləb bunu deməkdən ibarətdir ki, Sabir üslubunda tipi öz dili ilə ifşa etmək M. F.Axundovdan (Axundzadədən – U. Q.) gəlir. Mirzə Fətəlinin komediyalarında da, "Aldanmış kəvakib"ində də, Sabirin satiralarında da ifşa belə gedir: müəlliflər qüdrətli əllə bədii tiplərin gicgahlarından sıxırlar, bu zərbəyə tablamayan tiplər dərhal onların (Mirzə

Fətəlinin və Sabirin) bütün suallarına cavab verirlər. Bu cavablar səhihdir, heç bir əgər-əskikliyi yoxdur. Lakin bu tiplər vicdanlı, doğruçul insanlar olduqları üçün yox, yalan danışdıqca gicgahlarındakı barmaqların daha da kilidlənəcəyindən və gözlərinin öz hədəqəsini açacağından qorxduqları üçün düz danışırlar və beləliklə də şəxsi və ictimai qüsurlarını öz dilləri ilə açmış olurlar" (Hacıyev, 1980, s. 89).

M. F. Axundzadənin həm komediyalarında, həm də nəsr əsərində tiplərin öz dilləri ilə ifşası üsulu barədə akademik Feyzulla Qasımzadə belə yazmışdır: "Povestdə ("Aldanmış kəvakib" nəzərdə tutulur – U. Q.) mənfi tiplər, onların eybəcər simaları, ədibin komediyalarında olduğu kimi, öz sözləri və hərəkətləri ilə ifşa edilir" (Qasımzadə, 1974, s. 327).

Bütün bu göstərilənlərdən bir daha aydın olur ki, M. Ə. Sabir satirik tipi onun öz sözləri ilə ifşa etmək üsulunu seçərkən öz sələflərindən, klassik sənətkarlardan bəhrələnmişdir. O, M. F. Axundzadənin və S. Ə. Şirvaninin təcrübələrinə əsaslanmış, lakin elmi ədəbiyyatda da göstərildiyi kimi, yaradıcılığının bütün məqamlarında, o cümlədən klassik irsdən bəhrələndiyi zaman heç vaxt təkrarçılığa, təqlidə yol verməmiş, daim orijinal yazı tərzi nümayiş etdirmişdir. Bu haqda professor Mir Cəlal Paşayev haqlı olaraq yazmışdır: "Böyük şair həmişə, hər yerdə qələmə aldığı ictimai səhnələrə ən münasib və müvafiq söz, ifadə və formalar tapır. Şeir yaradıcılığında həyat həqiqətinə, ictimai ideal uğrunda mübarizə məqsədinə səcdə edən Sabir köhnə şeirin bütün köhnə forma və normalarını vurub dağıtmaqdan qorxmur, yeni təsəvvür və yeni düşüncəyə yeni söz və yeni ifadə üsulu gətirməyi şairin və şeirin mühüm vəzifəsi sayır" (Cəlal, 1961, s. 161).

"M. Ə. Sabirin özünün poeziya sələfləri ilə, o cümlədən Seyid Əzimlə canlı ünsiyyəti də onun yaradıcılığına təsirsiz ötüşməmişdir" (Şirvani, 1967, s. 51). Şairin tərcümeyi-halından görünür ki, o, bəzən S. Ə. Şirvani ilə şeirləşmiş, ustadının ona təqdim etdiyi mənzum əsərinə elə nəzmlə də cavab yazmışdır. Bu cür şeirləşmənin biri haqqında A. Səhhət belə məlumat vermişdir:

"Seyidin (S. Ə. Şirvaninin – U. Q.) bu qəzəlinə ki, mətləi-ati ilə başlayır:

Ey məh, bilirəm fitneyi-dövran olacaqsan,
Ey qaşı hilalım, məhi-taban olacaqsan"
(Sabir, 2004, s. 256).

Sabir cavab olaraq ona bir neçə şeir parçası yazıb göndərir:

"Sən pir-cahandidəsən, ey Seyyidi-sərkar!"
(Səhhət, 2005, s. 258).

S. Ə. Şirvaninin M. Ə. Sabirə yazdığı qəzəldə şagirdinin parlaq gələcəyinə böyük inam ifadə edilmişdir. Böyük şair uzaqgörənliklə bildirirdi ki, o, gələcəkdə öz istedadı, şairlik fəaliyyəti ilə “fitneyi-dövran”, “məhi-taban” olacaqdır. Yəni dövrünün problemlərini aydın, işıqlı bir dillə təsvir edəcəkdir.

Maraqlıdır ki, Sabirin ustadına cavabında da onun öz istedadına, parlaq şairlik gələcəyinə böyük bir güvən və inam öz əksini tapmışdır. Seyid Əzimin qəzəlinin vəzninə, ahənginə və rədifinə uyğun olaraq yazılmış cavab aşağıda öz əksini tapmışdır:

Sən piri-cahandidəsən, ey Seyyidi-sərkar,
Məndən çək əlin, eyləgilən pir ilə rəftar!
Olmaz sənə qismət dəxi bu dövləti-didar,
Bundan sora hicrimdə ciyərqan olacaqsan!
(Sabir, 2004, s. 42)

“Göründüyü kimi, zarafatyana yazılmış bu cavabda Seyid Əzim dünyagörmüş ustad bir sənətkar kimi dəyərləndirilir” (Şərif, 1962, s. 44). Eyni zamanda xatırladılır ki, artıq o qocalmışdır. Ona görə bundan sonra daha çox yaşlılarla oturub-durmağa üstünlük versə yaxşıdır. Çünki cavanlıq dövləti ona bir daha qismət olmayacaq. Sabir eyni şuxluqla sözünə belə davam edir:

Aşiq mənə bir mən kimi ziyba gərək olsun,
Mail gülə bir bülbüli-şeyda gərək olsun,
Səndə bu işə səbrü şəkiba gərək olsun.
Amma, bilirəm, səbr evi viran olacaqsan!
(Sabir, 2004, s. 42)

Sabir bildirirdi ki, bundan sonra o, gərək özü kimi cavan, enerjili və gələcəyi parlaq görünən gənclərlə oturub dursun. Elə gənclərlə ki onlar içi həyat eşqi ilə dolu olub, meyli güldə olan nəğməkar bülbülə bənzəsinlər. Şair öz ustadına xatırladır ki, yaşlı adamlarda belə bir istək olsa da, cavanlıq enerjiləri getdikcə azaldığı üçün belə məqamlarda hər şeylə barışmalı, səbirli və həyatın diktəsinə qarşı dözümlü olmağa çalışmalıdırlar. Sabir onu da göstərirdi ki, yaşlaşdıqca insan nə qədər müdrik və dözümlü olsa belə, yenə arada kəmhövsələlik edəcək, yəni “səbr evi viran olacaq” (Sabir, 2004, s. 42).

Şeirləşmənin nəticəsi haqqında Abbas Səhhət məlumat verərək yazmışdır: "Seyid "Xəmseyi-Nizamiyə"ni mütaliə etdiyi halda Sabirin məktubu yetişir. Oxuyub belə cavab yazır: "Nuri-didəm Sabir! Qəzəlimin birinə yazdığın məlih və şirin cavab çox xoşuma gəldi. Hazırda başqa bir şeyə gümanım olmadığından həmin kitabı sənə silə göndərirəm. Yadigari-ustadanəm olmaq şərtilə qəbul edəsiniz və şairlikdə tərəqqi etmənizi arzu edirəm" (Səhhət, 2005, s. 258).

## Nəticə

Bu məktub və hədiyyə M. Ə. Sabirin istedadına və gələcəyinə ustad xeyir-duası və dəyəri idi. O həmin etimadı yaradıcılığı ilə yüksək səviyyədə təsdiq etdi. İnsan ömrünün mərhələlərini müdrikliklə və realistcəsinə təsvir etməsi Sabirin gələcəkdə yaradıcılıq yolunun xarakterini də göstərirdi. Bu şeirləşmələr Sabirin öz dövrünün canlı klassikinə çevrilmiş bir sənətkarla kifayət qədər püxtələşmiş yaradıcılıq ünsiyyətinin məhsulları kimi də qiymətlidir.

## Ədəbiyyat

1. Bayramoğlu, A. (2001). *Mirzə Ələkbər Sabir* (qısa tərcümeyi-hal). Nurlan.
2. Cəlal, M. (1961). Sabir yaradıcılığında bədii sənətkarlıq. *"Azərbaycan" jurnalı,* 12, 154–165.
3. Hacıyev, T. (1980). *Sabir: qaynaqlar və sələflər*. Yazıçı.
4. Qasımzadə, F. (1974). *XIX əsr Azərbaycan ədəbiyyatı tarixi*. Maarif.
5. Mirbağırov, K. (1962). Sabir və Seyid Əzim Şirvani. "*Azərbaycan" jurnalı,* 5, 83–88.
6. Sabir, M. Ə. (2004). *Hophopnamə*. II cild. Tərtib edən, müqəddimə və şərhlərin müəllifi Məmməd Məmmədov. Şərq-Qərb.
7. Səhhət, A. (2005). *Seçilmiş əsərləri*. Tərtib edən, ön söz və qeydlərin müəllifi: Kamal Talıbzadə. Lider nəşriyyat.
8. Şərif, Ə. (1962). Sabirin nəzirələri. *Azərbaycan jurnalı*, 5, 89-96.
9. Şərif, Ə. (1962). *Sabir və Molla Nəsrəddin*. *Sabir* (məqalələr məcmuəsi). Az SSR EA.
10. Şirvani, S. Ə. (1967). *Əsərləri*. 3 cilddə, I c. Az SSR EA.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 96–103
https://doi.org/10.48445/l0213-3638-4682-h

# Mir Cəlal yaradıcılığında janr məsələsi

***Şakir Cəfərov*** [1]

**XÜLASƏ**
*Mir Cəlal ədəbiyyata bədii sözün ictimai həyatda güclü nüfuza malik olduğu bir dövrdə, ötən əsrin 30-cu illərində gəlmişdir. Belə bir dövrdə ictimai həyata sürətlə nüfuz edən ədəbi janrlar, xüsusən şeir, oçerk və hekayəyə daha çox müraciət olunduğundan, Mir Cəlalın da mətbuatda ilk çıxışı məhz bu janr istiqamətində olmuşdur. Ədib özü bu barədə yazmışdır: "Bir dəfə Mayakovskinin "Zərbəçi marşı" adlı şeiri əlimə keçdi, onu oxudum və nədənsə tərcümə etmək fikrinə düşdüm. Bir həftə sonra "Zərbəçi marşı" adlı tərcümə şeirim çıxdı. Bu mənim mərkəzi mətbuatda ilk yazım idi". Ədib bu nəşrdən başlayaraq ömrünün sonuna kimi paralel olaraq bədii və elmi yaradıcılıqla məşğul olmuşdur. Yazıçının yaradıcılıq psixologiyasına dərindən bələd olan akademik Nərgiz Paşayeva yazır: "Təxminən əlli illik bədii yaradıcılığında Mir Cəlal öz oxucuları ilə həmişə səmimi və obyektiv söhbət aparmışdır: həyat materialını hər cür "kosmetik ədəbiyyatlardan" uzaq, bütün həqiqətləri ilə, gözəllik və faciələri ilə, gülməli və ağlamalı tərəfləri ilə canlandırmağı bacarmışdır". Qeyd etməliyik ki, Mir Cəlalın 2013-cü ildə nəşr edilmiş felyeton, şeir, oçerk, tərcümə, xatirə və hekayələrdən ibarət beş cildlik əsərləri onun yaradıcılığının ideya-bədii vüsəti haqqında zəngin təsəvvür yaradır. Lirik təhkiyə ilə incə yumor, xəfif romantika, istehza və xoşməramlı gülüş Mir Cəlalın hekayələrində bir-birini tamamlayan bədii vasitələrdir.*

**AÇAR SÖZLƏR**
*ədəbi janrlar, bədii yaradıcılıq, Mir Cəlal, ədəbi psixologiya*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 22.03.2025
Qəbul edilib: 06.05.2025

[1] Filologiya üzrə fəlsəfə doktoru, doktorant, Bakı Dövlət Universiteti. Azərbaycan.
https://orcid.org/0009-0003-2454-9794 | shakird.jafarov50@gmail.com

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 96–103
https://doi.org/10.48445/l0213-3638-4682-h

# The Issue of Genre in Mir Jalal's Work

***Shakir Jafarov*** [1]

**ABSTRACT**

*Mir Jalal came to literature in the 1930s, at a time when the artistic word had a strong influence on public life. Since literary genres that rapidly penetrated public life, especially poetry, essays and stories, were increasingly used in such a period, Mir Jalal's first appearance in the press was precisely in this direction. The writer himself wrote about this: "Once I came across Mayakovsky's poem "Zarbachi Marshi", I read it and for some reason I had the idea to translate it. A week later, my translated poem "Zarbachi Marshi" was published. This was my first article in the central press." Starting from this publication, he was engaged in artistic and scientific creativity in parallel until the end of his life. Academician Nargiz Pashayeva, who is deeply familiar with the writer's creative psychology, writes: "In his nearly fifty years of artistic creativity, Mir Jalal has always had a sincere and objective conversation with his readers: he has managed to bring to life the material of life, far from all kinds of "cosmetic literature", with all its truths, with its beauty and tragedies, with its funny and tearful sides." It should be noted that Mir Jalal's five-volume works, consisting of feuilletons, poems, essays, translations, memoirs and stories, published in 2013, create a rich idea of the ideological and artistic scope of his creativity. Lyrical narration and subtle humor, light romance, irony and good-natured laughter are artistic means that complement each other in Mir Jalal's stories.*

**KEYWORDS**

*literary genres, artistic creativity, Mir Jalal, literary psychology*

**ARTICLE HISTORY**

Received: 22.03.2025
Accepted: 06.05.2025

---

[1] Doctor of Philosophy in Philology, PhD student, Baku State University. Azerbaijan.
https://orcid.org/0009-0003-2454-9794 | shakird.jafarov50@gmail.com

## Giriş

Mir Cəlal Azərbaycan ədəbiyyatının görkəmli yazıçılarından biridir. XX əsrin 30-cu illərində ədəbiyyata gələn yazıçı dövrünün ictimai və mədəni mühitinə uyğun olaraq, müxtəlif janrlarda öz qələmini sınamışdır. Onun əsərləri həm ədəbi, həm də elmi cəhətdən Azərbaycan bədii düşüncəsinin zənginləşməsində mühüm əhəmiyyət kəsb edir. Məqalədə Mir Cəlalın hekayə və oçerk yaradıcılığına nəzər salınmış, onun ədəbiyyat tarixində yeri müzakirə edilmişdir.

Mir Cəlalın hekayə və oçerkləri ilk dəfə 1930-cu ildə çap olunmuşdur. Dövrünün ruhuna uyğun olaraq, "Sağlam yollarda" (1932) adlandırdığı ilk oçerklər kitabında o, müasir həyat və insanlarla bağlı müşahidələrini qələmə almışdır. Ədib hekayə janrının klassik nümunələrini yaratmaqla yanaşı, roman janrının poetikasına da mühüm yeniliklər gətirmiş, filoloji fikrin inkişafına təməl olan elmi məktəb yaratmışdır.

30-cu illərdən başlayaraq, yaradıcılığı boyu ardıcıl olaraq bu janra müraciət edən yazıçı, ictimai-mənəvi həyatın ən dərin qatlarına nüfuz etmişdir. Akademik Məmməd Arif "Mir Cəlal mahir hekayə ustasıdır, onun hekayələri əksəriyyətlə yığcam və ibrətlidir", – deyərək öz qələm dostunun yaradıcılıq imkanlarını qiymətləndirmiş və onun bu janrın inkişafındakı xidmətlərini yüksək dəyərləndirmişdir. Mir Cəlalın "Anket Anketov", "Söyüd kölgəsi", "Təzə toyun nəzakət qaydaları", "Kəmtərovlar ailəsi", "Analar yola çıxdılar", "Qan qardaşı", "İclas qurusu", "Vətən yaraları", "Ərəb qızı", "Elçilər qayıtdı", "Xarici naxoşluq", "Subaylıq fəlsəfəsi" və digər hekayələri bu gün də oxucularımız tərəfindən maraqla oxunur.

Ədibin yaradıcılığını tədqiq etdikcə öyrənirik ki, Mir Cəlal hekayə janrına bütün yaradıcılığı boyu müraciət etmişdir. Yazıçının hekayələri fonunda, ümumilikdə Mir Cəlalın yaradıcılıq təkamülü ilə yanaşı, 1930–1970-ci illər Azərbaycan hekayəsinin estetik axtarışlarını və janrın poetikasındakı dinamikanı da izləmək mümkündür.

Akademik Mirzə İbrahimov yazırdı: *"Mir Cəlal klassik novellalar pişkinliyini xatırladan "Atlı" hekayəsində vətən eşqi ilə çırpınan saf bir insan qəlbinin necə qəhrəmanlıqlara qabil olduğunu təsvir edir".*

## Metodlar

Məqalədə Mir Cəlalın yaradıcılığı geniş şəkildə tədqiq edilmiş, mövzu, ideya və sənətkarlıq xüsusiyyətləri barədə elmi mülahizələr ifadə edilmişdir. Ədibin bədii yaradıcılığı polifonik məzmuna və dərin məna potensialına malikdir. Müstəqillik

dövrünün tədqiqatçıları da onun ədəbi-bədii irsini maraqla araşdıraraq, yaradıcılığının yeni aspektlərini elmi təhlil müstəvisinə çıxarmışlar. Bu, Mir Cəlalın əsərlərinin zaman keçdikcə daha aktual olduğunu və Azərbaycan ədəbiyyatında öz əhəmiyyətini qoruyub saxladığını göstərir.

**Nəticələr**

Azərbaycan ədəbiyyatında demək olar ki, bütün sənətkarlar öz yaradıcılıqlarında hekayə janrına müraciət etmişlər. Süleyman Rəhimov, Əli Vəliyev, Mehdi Hüseyn, İsmayıl Şıxlı, İlyas Əfəndiyev, Anar, Elçin və digər yazarlar ədəbiyyatımıza qiymətli hekayə nümunələri bəxş etmişlər. Lakin onların arasında dörd hekayə ustası xüsusilə seçilir: Mirzə Cəlil, Ə.Haqverdiyev, Y. V. Çəmənzəminli və Mir Cəlal. Bu ədiblərin əsərləri klassik hekayə janrının inkişafında mühüm yer tutmuş və bu janrın qızıl fondunu təşkil etmişdir.

Mir Cəlal ədəbiyyatımızı XX əsr oxucusunun milli bədii sərvəti olan romanlarla zənginləşdirmişdir. “Dirilən adam” (1934), “Bir gəncin manifesti” (1939), “Yolumuz hayanadır?” (1952), “Açıq kitab” (1952), “Təzə şəhər” (1950), “Yaşıdlarım” (1952) və digər romanları sənətkarın bədii irsinin zənginliyindən xəbər verir. Yazılma tarixlərindən də göründüyü kimi, Mir Cəlal 1950-ci ilə qədər iki roman qələmə almışdı. M. F. Axundzadə kimi, onun da romanlarının tarixi, əsasən, 1950–1955-ci illəri əhatə edir.

40-cı illərdən başlayaraq elmi yaradıcılıqla məşğul olan ədib 1940-cı ildə “Məhəmməd Füzulinin poetik xüsusiyyətləri” mövzusunda namizədlik, yeddi il sonra isə, 1947-ci ildə “Azərbaycanda ədəbi məktəblər” mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir.

Ümumiyyətlə, Mir Cəlalın bədii əsərləri doğma vətənini və xalqını təbiiliklə təqdim edərək, ölkənin sosial, mədəni xüsusiyyətlərini dərindən əks etdirir. Yazıçının əsərlərində milli dəyərlər, xalqın tarixi və gündəlik həyatı mükəmməl şəkildə təsvir olunur, bu da onun yaradıcılığını Azərbaycan ədəbiyyatının ən qiymətli nümunələrindən birinə çevirir. Oxucular onun əsərlərindən ölkəsinin və xalqının özünəməxsusluqları haqqında tam və geniş təsəvvürlər əldə edirlər. Əslində, böyük ədəbiyyatın əsas vəzifəsi və real missiyası da elə bundan ibarətdir.

Mir Cəlal Azərbaycan ədəbiyyatı tarixində çoxcəhətli yaradıcılıq fəaliyyəti ilə seçilən görkəmli sənətkarlardandır. O, həm yazıçı, həm ədəbiyyatşünas alim, həm də

müəllim kimi yüksək professionallıq istedadı nümayiş etdirmişdir. Bununla yanaşı, Mir Cəlalın publisistika sahəsindəki çoxillik və səmərəli fəaliyyətini də qeyd etmək lazımdır. Çünki onun publisistikası ədəbi yaradıcılığında əhəmiyyətli yer tutur. Ədib, ədəbi aləmdə 1932-ci ildə çap olunmuş “Sağlam yollarda” adlı ilk oçerklər kitabı ilə tanınmışdır. Sonralar isə bütün yaradıcılığı boyu publisistikanın müxtəlif janrlarında dəyərli nümunələr yaratmışdır.

Mir Cəlalın publisistik əsərləri yüksək bədii xüsusiyyətlərə malik olmaqla yanaşı, bir çox hallarda digər bədii nümunələrdən fərqlənmir. Lakin təəssüf ki, ədibin publisistik irsi hələ də tam olaraq toplanıb və nəşr olunmamışdır. Unutmaq olmaz ki, publisistika Mir Cəlalın bədii yaradıcılığında mühüm hazırlıq mərhələsi funksiyasını yerinə yetirmiş və onun əsərlərindəki ictimai və fəlsəfi məsələlərin daha dərin təhlilinə zəmin yaratmışdır. Bundan əlavə, yazıçının bədii yaradıcılığında publisistika elementləri də mövcuddur, bu da onun əsərlərində aktuallığın, müasirliyin və həyatiliyin daha da qüvvətlənməsinə təkan verir.

**Müzakirə**

Mir Cəlal hekayə janrının klassik nümunələrini yaratdığı kimi, roman janrının poetikasına da ciddi yenilik gətirmiş ustad yazıçı idi. Ədibin qələmə aldığı “Dirilən adam”, “Bir gəncin manifesti”, “Yolumuz hayanadır?”, “Açıq kitab”, “Yaşıdlarımız”, “Təzə şəhər” kimi əsərləri roman janrının tarixi təkamülünü əks etdirir. Bu əsərlərin hər biri ədəbi prosesə bir canlılıq gətirmiş və ədəbiyyatımıza yeni nəfəs qatmışdır. Bu səbəbdən, roman janrı ətrafında ən çox mübahisələrə, müzakirələrə səbəb olan əsərlər sırasında Mir Cəlalın yaradıcılığı xüsusi yer tutur və yazıçının romanlarında insan tarixi-inqilabi prosesin axarında təsvir olunur, çünki onun qəhrəmanları yeni ideya və bədii idealın daşıyıcılarıdır. Bu əsərlərdə fərdi talelər yazıçını daha çox düşündürür. Ədib yazdığı romanlarla ədəbiyyatımıza 1930–1960-cı illər gerçəkliyinin səciyyəvi cəhətlərini və tipik xarakterlərini gətirmişdir.

Bu altı romanın hamısı eyni səviyyədə, eyni poetikada, eyni sənətkarlıq mövqeyində dayanmasa da, Azərbaycan nəsrinin inkişafında hər birinin özünəməxsus yeri vardır. “Auditoriyada mühazirə deyə-deyə gəzirdi, arada dayanırdı, əlini hansımızınsa çiynimizə qoyub fikrini davam etdirirdi. Onda Mir Cəlal müəllim bir az da doğmalaşardı. – Roman çətin janrdır – deyirdi, – ona xırda mövzular yaramır. Roman üçün sənətkara xeyli təcrübə, hərtərəfli kamillik lazımdır. Sonra bizim tələbə olduğumuz o illərdə təzə yazılmış romanların qiymətinə keçir,

cavan yazıçıların yaradıcılığından həvəslə söhbət açırdı" (Məmmədli, 2023, s. 22–32).

Böyük ədib və ictimai xadim Mir Cəlal (1908–1978) çoxşaxəli yaradıcılıq fəaliyyətinə malik idi. Bədii yaradıcılıq, publisistika və elmi-pedaqoji fəaliyyət onun yaradıcılığının əsas istiqamətlərini təşkil edirdi. Görkəmli ədib ömrü boyu bu sahələrin hər biri ilə məşğul olmuş və bu istiqamətlər ədəbi-elmi mühitdə dərin iz buraxmışdır. Onun fəaliyyəti göstərir ki, yaradıcılıq sahələri biri digərini tamamlamış və daha da zənginləşdirmişdir. Mir Cəlalın hekayələri ilə oçerkləri, romanları ilə monoqrafiyaları arasında möhkəm daxili rabitə və qarşılıqlı əlaqənin olması həmin əsərlərin bədii və ya elmi səviyyəsinin yüksəlməsinə, mahiyyətinin dərinləşməsinə və hədəflərinin yaxınlaşmasına imkan yaratmışdır. Böyük ədib müraciət etdiyi hər bir elmi və bədii yaradıcılıq sahələrində yüksək peşəkarlığı ilə örnək ola bilmişdir (Həbibbəyli, 2023).

30-cu illərdən başlayaraq baş verən hadisələri, insanların xarakterik xüsusiyyətlərini, nikbin baxışlarını özündə əks etdirən "Mir Cəlalın poetikası" kitabının II cildi də monoqrafiya şəklində çap olunmuşdur. Hekayələrin geniş təhlili Vətən müharibəsi dövrünü (1941–1945) təsvir edir. Ədibin "İnsanlıq fəlsəfəsi", "Subaylıq fəlsəfəsi", "Vicdanın mühakiməsi", "Təsadüf, ya zərurət", "Qocaların uşaq söhbəti" və s. hekayələrində real həyat lövhələri, fəlsəfi düşüncələr öz əksini tapmışdır (Eminli, 2020).

Mir Cəlalın romanları Azərbaycan nəsrində mühüm yer tutur. Hekayələrində olduğu kimi, romanlarında da zamanın müşahidə etdiyi həyat həqiqətlərini əks etdirmişdir. Romanlarında insanın fəaliyyətinə və mənəviyyatına orijinal yazıçı baxışları ifadə olunmuşdur. Mir Cəlal hekayəçilikdə nümayiş etdirdiyi yüksək sənətkarlığı romanlarında daha çox inkişaf etdirmişdir. O, "Dirilən adam"ı (1934–1935) yazandan sonra "Bir gəncin manifesti" (1939), "Açıq kitab" (1941–1944), "Yaşıdlarım" (1946–1952), "Təzə şəhər" (1948–1950), "Yolumuz hayanadır?" (1952–1957) romanlarında həyatın geniş epik lövhələrini yaratmışdır.

Mir Cəlal əsərlərində süjet inkişafını ləngidən təfərrüatlardan qaçmağa cəhd edir, hadisə və mətləbin məğzini təşkil edənləri ön plana çəkir, bədii fikri məqsədəuyğun, bəzən ciddi, bəzən də yumoristik tərzdə oxucuya çatdırmağa çalışırdı. O istəyirdi ki, yaratdığı obrazların fəaliyyəti, şəxsi-ictimai taleyi, həyat yolu, daxili aləmi, fərdi psixologiyası açılsın; onlar münasib bədii cizgi və vasitələrlə səciyyələnsinlər.

Ədibin əlvan və zəngin sənət qalereyasında yaddaqalan surətlər də az deyil. Bəbir bəy, Qədir, Qumru (“Dirilən adam”), Mərdan, Bahar, Sona, Hacı İbrahim Xəlil (“Bir gəncin manifesti”), Vahid, Sadıq kişi, Kərim Gəldiyev, Rübabə (“Açıq kitab”), Kərimzadə, Səlim, Nəriman (“Yaşıdlarım”), Yunis (“Təzə şəhər”), Sabir, Əntiqə, Bəndalı (“Yolumuz hayanadır?”) və başqaları maraqlı obrazlardır.

“Mir Cəlalın əsas hekayə və romanları həyati problemlər qaldıran, mənəvi-əxlaqi və ictimai-sosial məsələləri əks etdirən oxunaqlı, məzmunlu və tərbiyəvi əsərlərdir. Xalqımızın inkişaf yolunun və mübarizə tarixinin bir çox mənalı və ibrətli səhnələri burada öz əksini tapmışdır” (İsmayılov, 2010).

Mir Cəlal “Dirilən adam” romanını yazmaqla (1934) Azərbaycan ədəbiyyatına mükəmməl tale romanı yazıçısı kimi daxil olmuşdur. Əsərdəki Qədir obrazı sərt ictimai mühitin girdabından çıxıb həyatda özünü təsdiq etmək üçün mübarizə aparan bir şəxsdir. O, cəmiyyətdə dayaq tapa bilməyən insanların keşməkeşli taleyini əks etdirir.

“Yaşıdlarım” (1946) avtobioqrafik romanında ədib milli ziyalılığın közərən işıqlarını qələmə almışdır. Qeyd etməliyik ki, Mir Cəlalın “Bir gəncin manifesti” romanı (1938) ədəbi tənqiddə haqlı olaraq, Azərbaycan ədəbiyyatının yeni dövrünün manifesti kimi təqdim edilmişdir.

“Yolumuz hayanadır?” (1957) romanında isə tarixiliklə müasirlik bir yerdə, üzvi vəhdətdə qələmə alınmışdır. Əsərdə Azərbaycan satirik şeirinin banisi olan Mirzə Ələkbər Sabirin keşməkeşli həyatı ön planda təqdim edilir.

## Nəticə

Beləliklə, XX əsrin 20–30-cu illərində ədəbi aləmdə əvvəlcə şeir, daha sonralar isə oçerk və hekayələri ilə tanınan Mir Cəlal qısa müddət ərzində iste-
dadlı və orijinal yaradıcılıq üslubu olan yazıçı kimi şöhrət tapmışdır. Səməd Vurğun, Süleyman Rəhimov, Süleyman Rüstəm, Mehdi Hüseyn kimi tanınmış ədiblərlə eyni dövrdə yaşayıb-yaratmış Mir Cəlal öz yazı üslubu ilə həmkarlarından fərqlənərək Azərbaycan ədəbiyyatına yeni nəfəs gətirmişdir. XX əsr Azərbaycan ədəbiyyatının bir sıra nailiyyətləri bilavasitə Mir Cəlal Paşayevin adı ilə bağlıdır. Əlli illik yaradıcılıq fəaliyyəti dövründə o, görkəmli nasir kimi Azərbaycan ədəbiyyatı tarixində öz layiqli və şərəfli yerini tutmuşdur. Əminliklə demək olar ki, yalnız “Bir gəncin manifesti” əsərinə görə Mir Cəlal klassik sənətkarlar sırasında öz yerini almışdır. Bu əsər çapdan çıxanda ədibin hələ 30 yaşı yox idi. Onun mətbuatda ilk şe-

irləri (“Dənizin cinayəti”, “Ananın vəsiyyəti”, “Müxbir”) 1928-ci ildə çap olunmuşdur. Lakin o, 1930-cu ildən etibarən, əsasən, hekayələr yazmağa başlamış, o dövrün “Şərq qadını”, “Gənc işçi”, “İnqilab və mədəniyyət”, “Ədəbiyyat qəzeti” kimi nüfuzlu nəşrlərində “Doktor Cinayətov”, “İfşa”, “Mərkəz adamı”, “Naxələf”, “Bostan oğrusu”, “Qüdrət nümayişi”, “İstifadə”, “Dəzgah qızı”, “Heyrət” və digər hekayələrini çap etdirmişdir. 1932-ci ildə “Sağlam yollarda”, 1935-ci ildə “Boy” adlı ilk oçerklər və novellalar kitabları işıq üzü görmüşdür.

**Ədəbiyyat**


1. Eminli, A. (2020). *Mir Cəlalın poetikası.* 3 cilddə, II c. www.kitabxana.net YYSIB-nin müştərək nəşri.
2. İsmayılov, Y. (2010). *Mir Cəlalın yaradıcılığı*. Elm.
3. *Mir Cəlalın Seçilmiş əsərləri* (Müasir Azərbaycan ədəbiyyatı). (2005). Şərq-Qərb.
4. Məmmədli, C. (2015). *Böyük alim, böyük müəllim. Mir Cəlal.* II cilddə. “Nurlar” nəşriyyatı.
5. Məmmədli, C. (2015). Bədii sözün “Ulduz” rəngi. *“Ulduz” jurnalı*.
6. Mütəllimov, T. (2004). *Ustad yadigarı* (ön söz). *Mir Cəlal. Azərbaycanda ədəbi məktəblər* (1905–1917). Ziya-Nurlan.
7. Mir Cəlal. (2005). *Seçilmiş əsərləri* (roman və hekayələr). Çaşıoğlu.
8. Mir Cəlal. (1980). *Bir gəncin manifesti*. Gənclik.
9. Mir Cəlal. (1932). *Sağlam yollarda: oçerklər*. Azərnəşr.
10. Mir Cəlal. (1984). *Yaşıdlar* (roman və hekayələr). Azərnəşr.
11. *XX əsr Azərbaycan ədəbiyyatı.* (1982). Maarif.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 104–114
https://doi.org/10.48445/c1839-4509-4951-h

# İnşa yazılarının təşkili və xüsusiyyətləri

***Sevinc Qəmbərova*** [1]

**XÜLASƏ**
*Məqalədə orta məktəblərdə inşa yazı işlərinin əhəmiyyətindən, onların təşkili və xüsusiyyətlərindən bəhs edilmişdir. İnşa yazıları şagirdlərin yazılı və şifahi nitq bacarıqlarını inkişaf etdirən səmərəli yazı növlərindən biridir. Mövzusuna görə bir neçə növə bölünür: rəy-inşalar, peyzaj, yaxud portretlərə həsr edilmiş inşalar və s. Məqalədə həmçinin inşa yazı növünə verilən tələblər də təqdim edilir. Belə ki, bu yazıları esse, ifadə və imla yazı növləri ilə həm birləşdirən, həm də ayıran cəhətlər mövcuddur. Tədqiqat işində yazıların ortaq və fərqli cəhətlərinə aydınlıq gətirilmişdir. Araşdırmanın yazılmasında təsviri, müşahidə və müqayisəli metodlardan istifadə edilmişdir.*

**AÇAR SÖZLƏR**
*inşa yazıları, növ, bənzərlik, fərqlilik, xüsusiyyət*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 13.04.2025
Qəbul edilib: 17.05.2025

[1] Filologiya üzrə fəlsəfə doktoru, Xəzər Universiteti. Azərbaycan.
https://orcid.org/0000-0002-2673-5051 | sevinc.qemberova@mail.ru

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 104–114
https://doi.org/10.48445/c1839-4509-4951-h

# The Organization and Characteristics of Essays

***Sevinj Gambarova*** [1]

**ABSTRACT**

*The article talks about the importance, organization and characteristics of essay writing in secondary schools. Essay writing is one of the effective types of writing that develop students' written and oral speaking skills. According to the topic, essays are divided into several types: opinion essays, essays dedicated to landscape or portraits, etc. The article also presents the requirements for the type of essay writing. Thus, these writings have both connecting and separating aspects with essay, expression and spelling writing types. The common and different aspects of the writings have been clarified in the research work. Descriptive, observational and comparative methods were used in writing the research.*

**KEYWORDS**

*essay writings, type, similarity, difference, characteristics*

**ARTICLE HISTORY**

Received: 13.04.2025
Accepted: 17.05.2025

[1] Doctor of Philosophy in Philology, Khazar University. Azerbaijan.
https://orcid.org/0000-0002-2673-5051 | sevinc.qemberova@mail.ru

 

## Giriş

Orta məktəblərin ilk tədris ilindən başlayaraq, Azərbaycan dili fənni üçün dörd əsas, dəyişməz məzmun xətti müəyyən edilmişdir. Oxu, dinləyib-anlama, dil qaydaları ilə yanaşı, yazı üzrə iş birinci sinifdən başlayaraq on birinci sinfə qədər davam etdirilir. Məktəbin ilk günündən etibarən, şagirdlərin şifahi nitqi ilə yanaşı, yazılı nitqinə də xüsusi diqqət yetirilir və bu, daima inkişaf etdirilir. Çünki savadlı, düzgün, məzmunlu yazı hər bir insanın dünyagörüşünün, mənəviyyatının, elmi səviyyəsinin əsas göstəricilərindəndir. Yazı zamanı şagirdlərin istər orfoqrafik, istərsə də kalliqrafik, texniki, üslubi, durğu işarələrinin yerində işlədilməsi ilə bağlı nöqsanlara yol verməmələrinə diqqət yetirilməli və dilin tədrisi prosesi bu istiqamətdə qurulmalıdır.

İşgüzar mühitdə müasir insanın yazılı olaraq istər akademik, istər publisistik, istərsə də bədii şəkildə fikirlərini ifadə edə bilmə bacarıq və vərdişlərinə yiyələnməsi vacib amillərdən biridir. Bu vərdişlərin formalaşdırılmasına təhsilin ibtidai səviyyəsindən başlanmalı, orta və yuxarı siniflərdə isə inkişaf etdirilərək davam etdirilməlidir. Fikirlərin yazılı formada düzgün və savadlı şəkildə ifadə edilməsinə olan tələbat hər dövr üçün aktualdır. Buna nail olmaq üçün müxtəlif yazı növlərinə müraciət edilməsi faydalıdır. Qeyd edək ki, yazı növlərinə həsr edilmiş vəsait və resurslar kifayət qədər deyil, olanların bəziləri isə dövrün tələblərinə cavab vermir. Ona görə də bu kimi məsələlərə elmin son yeniliklərini nəzərə alaraq və inkişaf etmiş ölkələrin təcrübələrindən bəhrələnərək yenidən müraciət etməyə ehtiyac vardır.

## Metodlar

Məqalənin yazılmasında müşahidə, müqayisə və təsviri metodlardan istifadə olunmuşdur.

## Nəticələr

1. İbtidai siniflərdən başlayaraq müxtəlif yazı növlərindən − inşa yazılarından istifadə şagirdlərin tənqidi və yaradıcı təfəkkürünün inkişafında mühüm rol oynayır.
2. İnşa yazılarının müxtəlif növləri üçün mövzuların seçilməsi, planın tərtib edilməsi və bütün bunlara hazırlıq prosesinin düzgün şəkildə təşkil edilməsi çox önəmlidir.
3. İnşa yazılarına ənəvi təlimdə müraciət olunurdu. Fəal təlimdə isə inşa yazıları ilə yanaşı, esse yazı növlərinə də müraciət edilir. Hesab edirik ki, bu yazı növlərinin

hər ikisi eyni mahiyyətə malikdir. Bu səbəbdən tədrisdə birinin saxlanılması daha məqsədəuyğun olardı.

4. Yazı təliminə, yazı növlərinə (imla, inşa, ifadə və s.), yazı işlərinin yoxlanılması və qiymətləndirilməsinə həsr edilmiş və bu sahədə əldə edilmiş yeni nəticələri özündə əks etdirən vəsaitlər və resurslar azdır. Gənc, bu sahədə təcrübəsi olan, başqa ölkələrin təcrübəsi ilə tanış olan mütəxəssislərin bu boşluğu doldurması arzuolunandır.

**Müzakirə**

Yazı, bəşər mədəniyyətinin ən böyük kəşflərindən biri olub, geniş imkanlara malik ünsiyyət vasitəsi kimi əsrlər və nəsillər arasında əlaqə yarada bilmək funksiyasını daşıyır. Tarixən müəyyən inkişaf mərhələlərində yazının müxtəlif növlərindən (əşyavi, fikri, şəkli, heca) istifadə edilmişdir. Hazırda hərfi (fonoqrafik) yazıdan istifadə edilsə də, digər yazı növləri tamamilə unudulmamış, müxtəlif məqsədlər üçün (brend, marka işarələrində, yaxınlıqda yeməkxana, xəstəxana, dərzi və s. olmasını göstərmək üçün) hələ də istifadə edilməkdədir. Yazılı nitq şifahi nitqdən bir sıra üstünlükləri ilə fərqlənir: qalıcıdır, düşünmək və səhvləri düzəltmək imkanı verir və s.

Yazı, şagirdlərin duyğu və düşüncələrinin dil normalarına uyğun qaydada, nəqli, təsviri və mühakimə xarakterli rabitəli mətnlər formasında ifadəsini təmin edir. Oxu prosesində qazanılan bacarıqlar yazılı ünsiyyət vasitəsilə genişləndirilərək qarşılıqlı əlaqəyə çevrilir. Yazı, qoyulmuş hər hansı problem və ya mövzu ilə bağlı fikir və mülahizələrin müvafiq formada verilməsini, görülmüş işin hesabatının hazırlanmasını təmin edir. Ədəbi dilin normalarına riayət etməklə, şagirdlərin tədqiqatçılıq və təşkilatçılıq bacarıqlarını nümayiş etdirməyə imkan yaradır (Azərbaycan Respublikasının Ümumtəhsil məktəbləri üçün Azərbaycan dili üzrə Təhsil proqramı, s. 135).

Ənənəvi dilçilik ədəbiyyatında ibtidai siniflərdən başlayaraq yazıya verilən bir sıra əsas tələblərlə tanış olaq. Professor Yəhya Kərimov bu barədə yazmışdır: “Yazı təliminin mühüm məsələlərindən biri də yazıda mailliyin gözlənilməsidir. Bu tələbə əməl edilməsi hərflərin elementlərinin bir-birinə paralelliyini, hərflər arasında məsafənin düzgün saxlanılmasını, nəticə etibarilə yazının gözəlliyini təmin edir. ...Mailliyi gözləyə bilməyən uşaqların əlindən tutub öyrətmək mümkündür (Kərimov, 2011, s. 119).

Gördüyümüz kimi, hərflərin mailliyinin gözlənilməsi məcburi bir tələb kimi irəli sürülmüşdür. Halbuki inkişaf etmiş ölkələrin təcrübəsinə və son dövrə aid yeni ədəbiyyatlara nəzər salsaq, bunun heç də belə olmadığının şahidi olarıq. Bu tələbin hələ də tədris edilməsi və ona əməl edilməsi ancaq ənənəyə olan sadiqliklə bağlıdır. Amma auditoriyada qarşı-qarşıya olan hər iki fikri demək doğru olardı.

“Ümumtəhsil məktəblərinin I sinfi üçün Azərbaycan dili fənni üzrə dərsliyin metodik vəsaiti”ndə verilmişdir: “Hərflərin mailliyi”. Latın əlifbasından istifadə edən bir çox Qərb ölkələrinin təcrübəsi göstərir ki, hüsnxət şriftlərinin müəyyən bucaq altında mailli olması vacib şərt deyil. Lakin Azərbaycanda formalaşmış hüsnxət ənənəsinə görə, əlyazısı hərfləri təxminən 20 dərəcə bucaq altında yazılır. Ölkəmizdə ibtidai sinif şagirdlərinə təklif olunan hüsnxət dəftərlərində də oriyentir şaquli xətlərin mailliyi 20–25 dərəcə arasında dəyişir. Məhz bu səbəblərdən dərslikdə təklif olunan hüsnxət normalarına görə hərflər 20 dərəcə bucaq altında yazılmalıdır (Nurullayeva, 2020, s. 16).

Ali məktəblərdə istifadə edilən “Ana dilinin tədrisi metodikası” dərsliyində yazılmışdır: “Hüsnxət təlimində diqqəti cəlb edən məsələlərdən biri də yazının rabitəliliyinin gözlənilməsidir. Vaxtilə elementli yazı tətbiq olunurdu. Elementli hərfin hər elementi üzrə məşq etdikdən sonra bunları bitişdirmək tələb edilirdi. ...Belə yazı vaxtı çox alır, uşağı yorur və elementləri bitişdirərkən müxtəlif səhvlərə yol verilməsi ilə nəticələnirdi. Ona görə də rabitəli yazı irəli sürüldü. Rabitəli yazı qələmi dəftərdən ayırmadan hərfləri birdəfəyə yazmağı tələb edir (Kərimov, 2011, s. 120).

Göründüyü kimi, hesab olunurdu ki, yazıda rabitəliliyin gözlənilməsi şagirdlərin yazılarında sürətliliyi təmin edir, həmçinin səhvlərə daha az yol verilir. Yəhya Kərimov yazı prosesində şüurluluğu təmin etmək məqsədilə hazırlıq dövründə yazıya verilən texniki tələblər sırasına aşağıdakı bəndi daxil etmişdir: “Hecalar və sözlər imkan daxilində rabitəli yazılmalıdır. Yazarkən əl mümkün qədər dəftərdən ayrılmamalıdır” (Kərimov, 2011, s. 122).

Təcrübə və müşahidələr göstərir ki, qələmi kağızdan ayırmadan hərfin konfiqurasiyasını tamamlamaq heç də, əvvəllər düşünüldüyü kimi, yazı sürətini artırmır, çünki bu məqsədə uyğunlaşdırılan hərf konfiqurasiyaları kifayət qədər mürəkkəbdir və əksinə, yazı sürətini azaldır. Bütün hərfləri bu məqsədə uyğunlaşdırmaq mümkün deyil, belə ki, əlifbamızda bir çox hərflər diakritik işarələrlə (Çç, Şş, Ğğ), üfüqi qoşa nöqtələrlə (Üü, Öö) müşayiət olunur və ya

perpendikulyar xətlərdən ibarətdir (Tt, Ff). Bu isə istənilən halda qələmi kağızdan ayırmağa səbəb olur və yazı sürətini aşağı salır (Nurullayeva, 2020, s. 15–16).

Yazı təliminin son məqsədi şagirdləri öz duyğu və düşüncələrinin sərbəst və əhatəli bacarıqlarına yiyələndirməkdir. Belə ki, artıq birinci sinifdən başlayaraq bu kimi xüsusiyyətlərin, vərdişlərin təməlinin yaranmasına çalışmalıyıq. Yazı məzmun xətti üzrə təqdim edilmiş standartlara görə, şagirdlər ibtidai siniflərdən başlayaraq öz arzu və hisslərini, əsərin qəhrəmanına münasibətini rabitəli cümlələrlə açıqca ifadə edə bilməli, mövzu ilə bağlı bir neçə cümlədən ibarət esse yazmalı və süjetli şəkillər üzrə, təxəyyülünə uyğun bədii mətnlər tərtibetmə bacarığına malik olmalıdırlar. Bütün bu cəhətlərin formalaşdırılması üçün müxtəlif yazı növlərinə (imla, inşa, ifadə, esse, çalışma) müraciət edilməsi məsləhətdir. Bu baxımdan, inşa yazıları, onların növləri və digər yazı işlərinin oxşar və fərqli cəhətləri barədə kompleks şəkildə danışmaq faydalıdır.

*İnşa* – nitq inkişafı üzrə işin ən yüksək formasıdır. ...Belə müstəqil yazılar şagirdlərin şifahi nitqinin, yaradıcı fəaliyyətinin, ətraf aləmlə tanışlığının, dünyagörüşünün ümumi inkişafına kömək edir. İnşa şagirddə emosiyaları, əqli müstəqilliyi oyadır, onlarda düşünmək, gördüklərini qiymətləndirmək və sistemləşdirmək, müşahidəçiliyi inkişaf etdirmək, səbəb-nəticə əlaqələrini tapmaq, tutuşdurmaq və müqayisə etmək, nəticə çıxarmaq qabiliyyətini inkişaf etdirir (Kərimov, 2011, s. 512–513). İnşa şagirdin yazılı nitq bacarıqlarını formalaşdıran tədris yazı növü olub, əsasən, bədii əsərlərin təhlili məqsədilə yazdırılır, şagirdin əsəri elmi-nəzəri aspektdən obyektiv dəyərləndirmə bacarığını formalaşdırır. Hər bir inşa bir neçə ünsürdən təşkil olunur: başlıq, epiqraf, giriş, əsas hissə, nəticə. Başlıq mövzu, problematika və elmi tezisə uyğun ola bilər. İnşaya epiqraf yazmaq mümkündür (Nəhmətova, 2020).

Hesab edirik ki, inşalar üzrə iş, şagirdlərin yazılı nitq bacarıqları ilə yanaşı, şifahi nitq bacarıqlarının da inkişafına öz töhfəsini verir. Tanınmış pedaqoq Ağarəhim Rəhimov haqlı olaraq göstərmişdir ki, "inşaların kollektiv müzakirəsi şagirdlərin obyekt haqqındakı biliklərinin genişlənməsinə və dərinləşməsinə, dinləmə qabiliyyətinin formalaşmasına və ən başlıcası, monoloji nitqlərinin inkişafına əsaslı təsir göstərir. İbtidai siniflərdə bu işin normal təşkili üçün müəllim şagirdlərin buraxdıqları səhvləri və müvəffəqiyyətləri şagird kollektivinin birgə səyi ilə meydana çıxarmalıdır" (Rəhimov, 2015, s. 456).

Orta məktəb proqramında inşa yazılarının bir çox növlərinə müraciət etmək olar. Onların bəziləri barədə məlumat verək.

*Rəy-inşa* – tədris prosesində hər hansı bir sənət nümunəsini, mədəni fəaliyyəti dəyərləndirmək üçün yazılan inşa növüdür. Rəydə obyektivliyin qorunması onun üslubunu şərtləndirən əsas xüsusiyyətlərdəndir. Artıq emosionallıq, kəskin dil və kəskin müqayisələr rəyin xüsusiyyətlərinə ziddir. Rəyin obyektivliyini göstərən əsas cəhət dəlillərin gətirilməsidir (Nəhmətova, 2020, s. 49–50). Müəllif bədii mətnə rəy yazmazdan öncə şagirdi esse-təəssürat və rəy-inşanın müqayisəsi ilə tanış etmək məqsədilə aşağıdakı fərqləri qeyd etmişdir:

**Yazı növünün əsas xüsusiyyəti**

*Esse-təəssürat*: Şagirdin əsər haqqında emosional-qiymətləndirici (ekspressiv) təhlili – şəxsi təəssüratı.

*Rəy-inşa:* Məzmun və forma vəhdəti əsasında bədii əsərin tənqidi analizi – əsərin obyektiv təhlili.

**Yazı növünün məqsədi**

*Esse-təəssürat:* Əsər haqqında təəssüratlarını bölüşmək; bəyəndiyi əsəri diqqətə çatdırmaq; müzakirədə iştirak etmək.

*Rəy-inşa:* Bədii əsərin ideya-poetik xüsusiyyətlərini qiymətləndirmək; esse-təəssüratın məqsədlərini müəyyən etmək və s. (Nəhmətova, 2020, s. 50–51).

“İnşa” sözü bəzi xarici dillərə “esse” kimi tərcümə edilir (essay). Yəni digər ölkələrdə esse yazıları inşaların ekvivalenti hesab edilir. Sovet təhsil sistemində və ənənəvi təlimdə yaradıcı yazı olaraq ancaq “inşa” termini işlədilirdi. Müstəqillik illərindən sonra dünya təhsilinə inteqrasiya edilərək fəal təlim metodlarından istifadə edildi və bununla da, tədrisə “esse” anlayışı daxil oldu. Buna baxmayaraq, hazırda da inşa anlayışından paralel olaraq istifadə edilir. Bu iki anlayış arasındakı fərqi müqayisə etsək, bəzən bu izahların özünü doğrultmadığının şahidi olarıq. Əgər mütəxəssislər inşaların obyektiv, esselərin isə subyektiv gerçəklikləri əks etdiyini bildirirsə, o zaman “Mənim anam”, “Mənim atam”, “Ana vətənim”, “Doğma məktəbim”, “Mənim ən böyük arzum” və s. mövzularda yazılmış yaradıcı mətnləri növünə görə necə ayırd etmək olar? Əgər inşalarda faktlar və sitatlar verilməlidir deyiriksə, bu, eynilə esse yazılarında da belədir. Ona görə zamanla *inşa* yazı növü anlayışı istifadədən çıxarılıb, əvəzinə *esse* termini işlədilsə idi, bu cür qarışıqlıq yaranmazdı. Çünki bu ifadələr eynilik təşkil etdiyi üçün onlar arasında sərhədləri müəyyən etmək çətinlik yaradır.

*Peyzaj-inşalar* adı altında ilin müxtəlif fəsillərində təbiət qoynunda keçirilən gəzintilər əsasında yazılan yazı işlərini qruplaşdırmaq olar. Belə ki, “doğma yerlərə ekskursiyalar, gəzintilər,ətraf aləmdəki əşya və hadisələr üzərində müşahidələr uşaq-

larda həssaslıq, təbiətə, gözəlliyə məhəbbət, onlardan zövq almaq, onları qorumaq hissini tərbiyə edir. Uşaqlar öz təəssüratlarını həvəslə ifadə edirlər" (Kərimov, 2011, s. 533–534). Hətta məqsəd sonradan inşa yazmaq olmasa belə, şagirdlər getdikləri gəzintilərdə gördüklərini mütəmadi olaraq tutduqları günlüklərə yazmağı vərdiş etsələr, bu onlar üçün çox faydalı olar. "Qoy meşə gəzintisindən, şəhər səyahətindən aldıqları və ya sadəcə ətraf aləmdən aldıqları təəssüratları öz "yazıçı blaknot"larında qeyd etsinlər. Onda uşaq təkcə seyr etməyi deyil, gəzməyi bacaracaq, gördüklərini sözə çevirə biləcək. Bunun nəticəsində başqalarının yazdıqlarına da diqqətlə yanaşacaq. Sözü yerində işlətməyin nə demək olduğunu anlayacaq" (Nəbiyeva, 2010, s. 73–74).

*Təsviri inşalar* hər hansı şəklin, əşyanın, heyvanın və s. təsvirinə həsr edilir. Bunun üçün ya təsvir obyektinin şəkli lövhədən asıla, ya monitorda nümayiş etdirilə, ya hər hansı bir heyvanın müqəvvası sinfə gətirilə bilər, yaxud da uşaqların çox görüb yaxşı bələd olduqları əşyaların yaddaşlarına əsaslanıb təsvir etməsi tapşırıla bilər. "Təsviri inşaların yazılması üzrə vərdişin inkişaf etdirilməsi üçün bənzər əşyaların müqayisə olunmasına geniş yer verilməlidir. III – VI sinif şagirdlərindən qazla ördəyin, pişiklə pələngin, itlə qurdun, maralla ceyranın, küknarla şamın müqayisəsi üzrə təsvir xarakterli inşa yazmağı tələb etmək olar. Bu sahədə müəyyən vərdiş yarandıqdan sonra günəşin çıxması ilə batmasına, payız meşəsi ilə yay meşəsinin müqayisəsinə həsr olunmuş inşalar yazdırmaq mümkündür" (Kərimova, 2011, s. 538).

İnşa növləri ilə tanışlıqdan sonra belə nəticəyə gəlirik ki, onların yazılması üçün müəyyən hazırlıq mərhələsinə ehtiyac vardır və bu mərhələ nə qədər düzgün istiqamətdə qurularsa, inşanın mətni də bir o qədər uğurlu alına bilər. Müəllim hazırlıq mərhələsini keyfiyyətli və səmərəli şəkildə təşkil edə bilərsə, şagirdlərin yol verə biləcəkləri səhvlərin qarşısını əvvəlcədən ustalıqla ala bilər. Könül Nəhmətova hazırlıq üçün əlavə ədəbiyyatların oxunması şərtini tövsiyə edərək inşa yazarkən şagirdlərin yol verdiyi tipik səhvlərə səbəb olan amilləri aşağıdakı kimi qruplaşdırmışdır:

- mövzuya uyğun olmayan materiallardan istifadə etmək;
- materialın təmin olunmaması;
- yazıda ardıcıllığın pozulması;
- hissələrin həcm tələblərinin pozulması;
- məzmunun plana uyğun olmaması;

– eyni fikirlərin təkrarlanması;
– sitatlardan istifadə bacarıqsızlığı (ya həddindən artıq istifadə etmək, yaxud heç istinad etməmək);
– tarixi, ədəbi, bioqrafik faktların təhrifi;
– müasirliklə süni əlaqələndirmə;
– hissələr arasında məntiqi əlaqəsizlik;
– mənbələrdən uyğunsuz istifadə (Nəhmətova, 2020, s. 49).

İnşa və digər yazı növləri (yaradıcı imla, ifadə, esse və s.) arasında fərqli xüsusiyyətlərlə yanaşı, müəyyən ortaq cəhətlər də vardır. Yaradıcı imla şagirdlərə öz fikirlərini müstəqil olaraq ifadə etmək və qazanılmış orfoqrafik vərdişləri möhkəmləndirmək imkanı verən yazı növüdür. Bu yazı növü şagirdlərin yaradıcı qabiliyyətini inkişaf etdirməkdə mühüm rol oynayır. Yaradıcı imlalarda şagirdlər ancaq diktə edilənləri yazmaqla kifayətlənmir, diktə edilən söz və ya cümlələrə müəyyən şərtlərə uyğun əlavələr edir, onu tamamlayır və sonra yazırlar (Balıyev, H., Balıyev, A., 2014, s. 255).

Göründüyü kimi, yaradıcı imlalar inşa və imla yazı növləri arasında bir mövqeyə malikdir. Yazının imla növü inşalara hazırlıq mərhələsi kimi səmərəlidir. Şagirdin verilən açar sözlərdən istifadə edərək yaradıcı şəkildə söz birləşməsi, cümlə və mətn tərtib etməsi bu yazı növünü inşalara yaxınlaşdırır. Standart imlalarda olduğu kimi, hər söz diktə edilərək yazdırılmır, şagirdin təxəyyülü işə salınır və verilən sözləri cümlələrdə istifadə edərək rabitəli mətn hazırlanır. İnşalarda mövzu ümumilikdə tam bir mətn üçün verilirsə, yaradıcı imlalarda hər bir cümlənin tərtib edilməsi üçün bir söz təqdim olunur.

Dil dərslərində sərbəst imlalar, qrammatik ifadə və inşalar daha çox rabitəli nitqin inkişafına xidmət edir. Qrammatik ifadələrdən istifadə aşağıdakı əlamətlərinə görə faydalıdır:

1. Mətnin məzmununun rabitəli ifadəsi nitq vərdişlərini inkişaf etdirir.
2. Yazılı formada ifadə düzgün yazını, qrammatik bilikləri təkmilləşdirir.

Şagirdlərin müstəqilliyi və yaradıcılığı üçün şərait yaradılır yazırlar (Balıyev, H., Balıyev, A., 2014, s. 280–281).

Göründüyü kimi, ifadə yazılarının şagirdlərin inkişafına olan faydaları sadalanarkən yaradıcı təfəkkürün formalaşması da qeyd edilir. Bu cəhət inşa yazılarında da əsas prinsiplərdən biri hesab olunur.

Şagirdlərə, tələbələrə dilimizin mədəni irs kimi nə qədər dəyərli olduğunu öyrətməklə, onların dilimizin qorunması istiqamətində məsuliyyət hissi qazanmalarını təmin etmək mümkündür. Bu yanaşma onlarda dilə olan sevgini artıracaq və dilin yalnız bir ünsiyyət vasitəsi deyil, həm də milli kimliyimizin, tariximizin və mədəniyyətimizin ayrılmaz bir parçası olduğunu anlamalarına kömək edəcək (Teymurlu, 2024, s. 97). Bu gün məktəblərdə şagirdlərin inşa yazmaq sahəsində fəallığının azalmasının əsas səbəblərindən biri hazır inşa toplularının geniş yayılmasıdır. Bu, şagirdlərin yaradıcı düşüncə qabiliyyətlərini məhdudlaşdıraraq, inşa yazma vərdişlərinin inkişafına mənfi təsir göstərir (Nəbiyeva, 2010, s. 72).

## Nəticə

İnşa yazıları şagirdlərin yazılı rabitəli nitqini, yaradıcı düşünmə qabiliyyətini inkişaf etdirən yazı növüdür. İbtidai siniflərdən etibarən, şagirdlərin duyğu və düşüncələrini yığcam şəkildə ifadə edə bilmək bacarığını formalaşdırmaq və yuxarı siniflərə doğru bu bacarıqlarını daha da inkişaf etdirmək müəllimin qarşısına qoyulan əsas tələblərdəndir. Bu sahəyə həsr edilmiş ədəbiyyatlarla tanışlıq zamanı şahid oluruq ki, digər yazı növləri (imla, esse) barədə əhatəli və sistemli məlumat vardır. İnşa yazıları haqqında da belə bir araşdırmaya ehtiyac duyulur.

Araşdırmada inşalar, onların növləri və digər yazı növləri ilə müqayisəsi və s. məsələlərə toxunulmuşdur. Materialdan həm orta məktəb müəllimləri, həm də ali məktəblərdə bu mövzuların tədrisi ilə məşğul olan müəllimlər və tələbələr istifadə edə bilərlər.

## Ədəbiyyat

1. *Azərbaycan Respublikasının Ümumtəhsil məktəbləri üçün Azərbaycan dili üzrə Təhsil proqramı* (kurikulumu). ARTİ.
2. Balıyev, H., Balıyev, A. (2014). *Azərbaycan dilinin tədrisi metodikası*. Qismət.
3. Cəfərova, N. (2016). *İbtidai siniflərdə Azərbaycan dilinin tədrisi metodikası*. ADPU-nun mətbəəsi.
4. Kərimov, Y. (2011). *Ana dilinin tədrisi metodikası*. Kövsər.
5. Nurullayeva, Ü., Bayramova, İ., Zahidova, Ş., Allahverdiyeva, N., Xanalıyeva, A. (2020). *Ümumtəhsil məktəblərinin 1-ci sinfi üçün Azərbaycan dili fənni üzrə dərsliyin metodik vəsaiti*. Radius.
6. Nəhmətova, K. (2020). *Yazı işinin təşkili metodikası.* ARTİ.

7. Nəhmətova, K. (2022). *Esse: yazı tiplərinə görə növləri*. Elm və təhsil.
8. Nəbiyeva, Ş. (2010). *Ana dilinin tədrisi metodikasının aktual problemləri* (Metodik vəsait). ADPU-nun mətbəəsi.
9. Rəhimov, A. (2015). *Əsərlər*. 20 cilddə. XX cild (Ana dilinin tədrisi metodikası (ibtidai siniflərdə). BDU nəşriyyatı.
10. Paşayeva, Ş. (2007). *Ana dilinin tədrisində nəzəri və praktik məsələlər*. Təhsil.
11. Teymurlu, Z. (2024). Tədris mühitində dilin qorunması. *Azərbaycan məktəbi*, 3(708), 91–98.

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 115–123
https://doi.org/10.48445/h7703-9912-0456-w

# 1960–1980-ci illər Azərbaycan nəsrində psixologizm müqayisəli ədəbiyyatşünaslığın təhlil obyekti kimi

***Aynur Bədəlova*** [1]

**XÜLASƏ**

*Müqayisəli ədəbiyyatşünaslıq, ədəbiyyatşünaslığın əsas istiqamətlərindən olub, müxtəlif xalqların və tarixi dövrlərin ədəbiyyatlarının ümumi qanunauyğunluqlarını və əlaqələrini fərqli ədəbi ənənələrlə müəyyən etmək məqsədi daşıyır. Müqayisəli ədəbiyyatşünaslığın müqayisəvi istiqamətlərini müəyyənləşdirən ədəbiyyat tarixi, ədəbi tənqid və ədəbiyyat nəzəriyyəsinin mahiyyətini öyrənmədən onlar arasındakı ədəbi əlaqəni aşkar etmək mümkün deyil. Məqalədə müqayisəli ədəbiyyatşünaslığın mahiyyəti və müqayisəvi istiqamətləri müəyyənləşdirilmiş, həmçinin 1960–1980-ci illər Azərbaycan nəsrində psixologizmin müqayisəli ədəbiyyatşünaslıqda tədqiqi məsələlərinə diqqət yetirilmişdir. Azərbaycan nəsrində psixologizmin spesifik xüsusiyyətlərini daha dərindən təhlil etmək üçün onun milli və dünya ədəbiyyatı ilə müqayisəsi zəruridir. Bu baxımdan, 1960–1980-ci illər Azərbaycan nəsrində psixologizm insanın mənəvi aləmini, onun psixoloji münaqişələrini, daxili mübarizələrini öyrənmək üçün mühüm əhəmiyyət kəsb edir. Bu dövrün Azərbaycan ədəbiyyatı bəzi spesifik xüsusiyyətlərinə baxmayaraq, insanın sosial-psixoloji həyatında baş verən mühüm dəyişiklikləri əks etdirərək qlobal ədəbi proseslərdə aktiv şəkildə iştirak edir.*

**AÇAR SÖZLƏR**

*ədəbiyyat tarixi, sosial-psixoloji dəyişikliklər, milli ədəbiyyatlar, müqayisəli ədəbiyyatşünaslıq, psixologizm*

**MƏQALƏ TARİXÇƏSİ**

Göndərilib: 11.03.2025
Qəbul edilib: 14.05.2025

[1] Müəllim, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
https://orcid.org/0009-0002-9288-6218 | badalovaaynurrr@gmail.com

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 115–123
https://doi.org/10.48445/h7703-9912-0456-w

# Psychologism in Azerbaijani Prose of the 1960s–1980s As an Object of Analysis of Comparative Literary Criticism

***Aynur Badalova*** [1]

**ABSTRACT**

*Comparative literary criticism is one of the main directions of literary criticism, and aims to determine the general regularities and relationships of the literatures of different peoples and historical periods with different literary traditions. It is impossible to reveal the literary relationship between them without studying the essence of literary history, literary criticism and literary theory, which determine the comparative directions of comparative literary criticism. The article defines the essence and comparative directions of comparative literary criticism, and also pays attention to the issues of studying psychologism in Azerbaijani prose of the 1960s–1980s in comparative literary criticism. In order to analyze the specific features of psychologism in Azerbaijani prose in more depth, it is necessary to compare it with national and world literatures. From this point of view, psychologism in Azerbaijani prose of the 1960s–1980s is of great importance for studying the spiritual world of man, his psychological conflicts, and internal struggles. Despite some specific features, Azerbaijani literature of this period actively participates in global literary processes, reflecting important changes in human socio-psychological life.*

**KEYWORDS**

*literary history, socio-psychological changes, national literatures, comparative literary studies, psychologism*

**ARTICLE HISTORY**

Received: 11.03.2025

Accepted: 14.05.2025

---

[1] Teacher, Azerbijan State Pedagogical University. Azerbaijan.
https://orcid.org/0009-0002-9288-6218 | badalovaaynurrr@gmail.com

 

## Giriş

Müqayisəli ədəbiyyatşünaslıq tarixi və ədəbi bir termin olaraq ədəbiyyat elminin bir hissəsini təşkil edir. Müqayisəli ədəbiyyatşünaslıq dedikdə, ədəbiyyatın ədəbiyyat tarixi, ədəbi tənqid və ədəbiyyat nəzəriyyəsi, həmçinin milli və dünya ədəbiyyatı ilə birbaşa və ya dolayı yolla əlaqəsi nəzərdə tutulur. "Ədəbi proses"də qeyd olunduğu kimi: *"Ədəbiyyatı dərindən dərk etmək və araşdırıb öyrənmək üçün zəruri olan bir neçə istiqamət vardır ki, bunların sırasında ədəbiyyat tarixçiliyi, ədəbiyyat nəzəriyyəsi və müqayisəli ədəbiyyatşünaslıqla yanaşı, həm də ədəbi tənqid baxımından təhlillər və dəyərləndirmələrin xüsusi əhəmiyyəti vardır"* (AMEA, 2019, s. 3).

Əgər mövzu elm və ədəbiyyatın qarşılıqlı əlaqəsindən bəhs edirsə, ədəbiyyatla bağlı "elm" anlayışına dair mülahizələrə də xüsusi diqqət yetirilməlidir. Müqayisəli ədəbiyyatşünaslığın müqayisəvi istiqamətlərini müəyyənləşdirən ədəbiyyat tarixi, ədəbi tənqid və ədəbiyyat nəzəriyyəsinin mahiyyətini dərindən öyrənmədən bu sahələr arasındakı əlaqələri izləmək mümkün deyil. Şübhəsiz ki, ədəbi tənqidin hər bir sahəsinin öz məzmunu vardır. Məsələn, ədəbi tənqid ayrı-ayrı ədəbi hadisələri tədqiq edir, onların bədii dəyərini və orijinallığını müəyyən etməyə səy göstərir. Xüsusilə vurğulamaq lazımdır ki: *"Qədim və zəngin tarixə malik olan Azərbaycan ədəbiyyatının mühüm qollarından birini ədəbi tənqid və ədəbiyyatşünaslıq təşkil etməkdədir. Lakin Azərbaycan ədəbiyyatının digər istiqamətləri ilə müqayisədə ədəbi tənqid tarixi kifayət qədər öyrənilməmiş, ciddi, sistemli tədqiqatdan kənarda qalmışdır"* (Sultanlı, 2009, s. 3).

Ədəbiyyat tarixi dünya və müxtəlif milli ədəbiyyatların inkişaf dinamikalarını araşdırır, onların özünəməxsusluğunu üzə çıxarır, eyni zamanda müxtəlif ədəbi simaların yaradıcılıq yollarını təhlil edərək, həmin dövrün proseslərində onların yerini müəyyənləşdirir. Ədəbiyyat nəzəriyyəsi isə ədəbiyyatın inkişaf qanunauyğunluqlarını, üslublarını, ədəbi cərəyanları, janrları, növləri, əsərlərin struktur xüsusiyyətlərini, dilini və digər ifadə vasitələrini öyrənir. Nəzərdən keçirdiyimiz müqayisəli və ümumi ədəbiyyat konkret inkişafla müəyyən dil və ya tarixi çərçivə daxilində yaranmış müxtəlif ədəbi hadisələri əhatə edir. Deməli, ədəbiyyatşünaslığın bütün sahələrində sistemli bir yanaşma müşahidə olunur və elmin əsasını məhz bu sistem təşkil edir.

Müqayisəli ədəbiyyat ümumi nəsr və estetika problemlərinə toxunur, eyni zamanda ədəbiyyat nəzəriyyəsi ilə əlaqədədir. Müqayisəli ədəbiyyatın istiqamətlə-

rindən biri müxtəlif ədəbiyyatların bir-birilə müqayisəsidir. X. Abbasova qeyd edir: *“Ədəbi təsir və əlaqələr dünya ədəbi-bədii düşüncəsinin təbii qanunauyğunluqlarındandır və dünya ədəbi-mədəni irsinin zənginləşməsinə xidmət edir”* (Abbasova, 2019, s. 23).

Tədqiqatın əsas məqsədi 1960–1980-ci illər Azərbaycan nəsrində psixologizmin müqayisəli ədəbiyyatşünaslıqda təsir sahəsini araşdırmaq və onun mahiyyətini təhlil etməkdir. Bu məqsəd çərçivəsində əsərlərin, janrların, üslubların və mövzuların müqayisəsinə, həmçinin müxtəlif ədəbiyyatlar arasında baş verən təsirlərin analizinə yönəlmişdir. Mövzunun geniş şəkildə araşdırılması, müxtəlif mənbələrə istinad edilərək tədqiqi bugünkü günümüzdə müqayisəli aspektdən ədəbiyyata göstərilən marağın artdığını və ədəbiyyatın dərindən öyrənilməsinə olan tələbin yüksəldiyini göstərir. Bu cəhətdən mövzu aktual hesab edilir. Tədqiqatın elmi yeniliyi, müqayisəli ədəbiyyatşünaslığa yeni bir yanaşma təqdim etmək və 1960–1980-ci illər Azərbaycan nəsrində psixologizmin müqayisəli ədəbiyyatşünaslıq kontekstində araşdırılma imkanlarını müəyyənləşdirməkdən ibarətdir.

## Metodlar

Müqayisəli ədəbiyyatşünaslığın tədqiqi və 1960–1980-ci illər Azərbaycan nəsrində psixologizmin müqayisəli ədəbiyyatşünaslıqda öyrənilməsi yollarını araşdırmaq, yeniliklərə nail olmaq üçün müşahidə metodundan istifadə edilmişdir. Müşahidənin mahiyyəti müxtəlif mənbələrə istinad etmək, fərqli aspektlərdən faydalanmaq və qoyulmuş problemin həlli üsuluna nail olmaqdır. Həmçinin ümumiləşdirmə metodu vasitəsilə tədqiqata cəlb olunmuş mənbələrdən əldə olunan ümumi məlumatlar sistemləşdirilmiş və müəllifin fikirlərində öz əksini tapmışdır. Tədqiqat prosesində müsahibə metodu da tətbiq edilmişdir. Müsahibələr müəllifin birbaşa qarşılıqlı əlaqəsi şəklində yerinə yetirilmişdir. Eyni zamanda mövzu ilə bağlı digər tədqiqatçıların fikirlərinə və onların aparmış olduğu araşdırmalara nəzər salınmışdır.

## Nəticələr

Məqalənin yazılması prosesində bir sıra nəticələr əldə edilmişdir. Müxtəlif metodlardan istifadə etməklə müqayisəli ədəbiyyatşünaslığın istiqamətlərinə nəzər salınmışdır. Milli ədəbiyyatın dünya ədəbiyyatı ilə əlaqəli şəkildə öyrənilməsi həm ədəbiyyatlar arasında qarşılıqlı əlaqəni açıqlayır, həm də personajların müqayisəsi və əsərlərin ideya-bədii istiqamətindəki oxşar və fərqli aspektləri müəyyənləşdirir.

Məqalənin tədqiqi həmçinin bir sıra elmi əhəmiyyət kəsb edən məsələləri əhatə edir. Belə ki, məqalədə araşdırılmış məsələlər və əldə olunan nəticələr gənc tədqiqatçılar, filoloqlar və doktorantlar üçün məqalə və tezislərin yazılmasında gərəkli mənbələrdən hesab oluna bilər. Tədqiqat işi həmçinin ədəbiyyat nəzəriyyəsinin zəruri problemlərinin öyrənilməsində də tətbiq oluna bilər.

**Müzakirə**

Müqayisə zamanı tətbiq edilən metod müqayisəli metoddur. Bu metod müqayisə olunan bədii əsərlər arasında oxşar və fərqli cəhətləri müəyyən etmək baxımından əhəmiyyətlidir. Burada müqayisə təkcə bədii əsərlərdəki süjet xətti ilə deyil, həm də personajların müqayisəsi əsasında aparılır. Müqayisəli metod müxtəlif ədəbiyyatlar arasında əlaqə və oxşarlıqların öyrənilməsinə kömək edir. Müqayisəli ədəbiyyat bizə ümumi mövzuları, motivləri, janr və formaları müəyyənləşdirməyə, həmçinin müxtəlif mədəniyyətlərin və tarixi kontekstlərin ədəbi ənənələrin inkişafına təsirlərini araşdırmağa imkan verir.

Müqayisəli ədəbiyyatşünaslığa bir neçə mühüm yanaşma aiddir. Məsələn, müxtəlif mədəniyyətlərdə ədəbi janr və formaların inkişafının müqayisəsi, müxtəlif xalqların əsərlərindəki oxşar və ya ümumi mövzuların (məhəbbət, müharibə, mübarizə, qəhrəmanlıq) təhlili, müxtəlif xalqların ədəbiyyatlarının qarşılıqlı təsirini öyrənmək, ədəbi ənənələrdəki uyğunlaşmaları müəyyənləşdirmək və müxtəlif ədəbiyyatlarda oxşar ədəbi cərəyanların təhlil edilməsi. Bu müqayisəli yanaşma ədəbiyyatın milli və ümumi istiqamətlərini daha dərindən dərk etməyə, həmçinin xalqlar arasında mədəni və ədəbi əlaqələrin inkişafını anlamağa kömək edir. Mənbələrin birində deyildiyi kimi: *"Ədəbi əlaqə və təsirlər bir ədəbiyyatın digərinin bədii təcrübəsinin mənimsənilməsində (və aradan qaldırılmasında) ədəbiyyatların daimi qarşılıqlı təsirindən ibarət ədəbi prosesin əsas xüsusiyyətlərindən biridir"* (Rukopis, 2015).

1960–1980-ci illərdə Azərbaycan ədəbiyyatı müəyyən aspektdə inkişaf etmiş, dəyişikliklərlə yadda qalmış və bu prosesdə müqayisəli ədəbiyyat böyük əhəmiyyətə malik olmuşdur. Mənbələrdən birində qeyd olunur: *"XX əsr Azər baycan ədəbiyyatının başlıca mövzusunu müəyyənləşdirərkən biz ilk növbədə ilk məfhum bədii ədəbiyyat üçün bütün əsrlər boyu heç bir zaman mücərrəd səslənməmişdir. Belə ki, əsl humanist ədəbiyyatın bütün məna və mahiyyəti xalqın və insanın taleyi ilə bağlı olmuşdur"* (Paşayeva, 2003, s. 4).

Bu dövrdə ədəbiyyatşünasların diqqəti Azərbaycan nəsrinin müxtəlif istiqamətlərinin tədqiqinə, həmçinin onun dünya ədəbiyyatı kontekstində inkişafının, psixologizm kimi yeni təhlil üsullarının mənimsənilməsinə istiqamətlənmişdir. Fəal inkişafda olan psixologizm metodu personajların vəziyyət və sosial prosesləri daha dərindən dərk etmək imkanı yaradır, mürəkkəb psixoloji və sosial konfliktləri araşdırmağa kömək edir. Yazıçılar təkcə hadisə və mühitin təsirinə deyil, xarakterlərin mənəvi dünyasına daha çox diqqət yetirməyə başlayırlar. Psixologizm bir metod olaraq ədəbiyyatda özünəməxsus yer tutur, bu və ya digər şəkildə ifadəsini tapır. *"Ədəbiyyatda psixologizm personajların daxili aləminə, hisslərinə, düşüncələrinə və motivlərinə diqqət deməkdir. Bu yanaşma fərdi qavrayış və emosional təcrübəyə nəzər yetirməklə, insan hərəkətləri və reaksiyalarının altında mövcud mürəkkəb psixoloji prosesləri araşdırır"* (Chto takoye psikhologizm, 2024).

Müqayisəli ədəbiyyatşünaslıq çərçivəsində 1960–1980-ci illər Azərbaycan nəsrində psixologizm mövzusu insan düşüncəsində baş verən əhəmiyyətli dəyişiklikləri, o cümlədən personajların mənəvi təcrübələrinin və psixoloji təəssüratlarının formalaşmasını əhatə edən bir istiqamət olaraq, Azərbaycanda ədəbi prosesin mühüm tərəflərini əks etdirir.

Müqayisəli ədəbiyyatşünaslıq sayəsində 1960–1980-ci illər Azərbaycan ədəbi nəsri və psixologizm metodu daha fəal şəkildə öyrənilməyə başlanıldı. Bu istiqaməti araşdırmaq üçün bir neçə əsas aspekti nəzərdə saxlamaq zəruridir. 1960–1980-ci illər ədəbiyyatında psixologizmin əsas tendensiyalarını bilmək vacibdir. Ümumi məzmunda 1960–1980-ci illər ədəbiyyatda psixologizmin xüsusi əhəmiyyət daşıdığı bir ədəbi metod idi. Bu dövr personajların mənəvi dünyasının, fərdi fikirlərinin, davranışlarının, hiss və düşüncələrinin aparıcı olması ilə, o cümlədən Azərbaycan ədəbiyyatında şəxsiyyətə, onun daxili dünyasına, xarakterinə, hisslər aləminə marağın artması ilə xarakterizə olunur. Azərbaycan ədəbiyyatında psixologizm dedikdə, təkcə qeyd etdiyimiz ədəbi-tarixi dövr nəzərdə tutulmur. Psixologizm digər dövrlərlə nisbətdə XX əsrin ikinci yarısında yazıçıların qələmi ilə daha sürətlə yayılmağa başladı. 1960–1980-ci illərdə psixologizm İsmayıl Şıxlı, Fərman Kərimzadə, Anar, Elçin, Sabir Azəri kimi yazıçıların yaradıcılığında xüsusilə aydın şəkildə ifadə edilməyə başladı. Onlar əsərlərində personajların emosional həyat tərzinin psixoloji analizini, şəxsi arzularla mühüm istəklər arasındakı ziddiyyətləri müəyyən edirdilər. M. İmanov çox düzgün vurğulayır: *"Personajların daxili aləmini ön plana çəkən və gerçəkliyi qəhrəmanın könül aynasında əks etdirməyə meyl göstərən psixoloji nəsr "zahiri" və "ümumi işarə" formaları ilə kifayətlənə bilmir*

*və daxili duyğu və düşüncələrin "birbaşa" ifadəsinə xüsusi ehtiyac duyur. "Əlbəttə, psixoloji təhlil sistemində insanın daxili aləminin birbaşa ifadəsi aparıcı rol oynayır"* (İmanov, 2021).

Bu dövr yeni şəxsiyyət axtarışları, tarixi dəyişikliklər kontekstində insanın mənəvi aləminin mürəkkəbliyi ilə diqqət mərkəzindədir. Dövrün tənqidçi və ədəbiyyatşünasları yazıçıların yaradıcılığını müxtəlif aspektlərdən tədqiqata cəlb etsələr də, əsas istiqamət insan və onun daxili aləminin tədqiqi olmuşdur. Tədqiqatçılardan M. İmanov, A. Hüseynov, Y. Qarayev, Y. Axundov, V. Quliyev, T. Salamoğlu və digərlərinin adlarını çəkmək olar. T. Salamoğlunun fikrincə: *"Çağdaş ədəbiyyatşünaslıq tələb edir ki, tənqidçi bədii ədəbiyyatın nəzəri məsələlərini dərindən bilməli, ədəbiyyatın keçdiyi tarixi inkişaf yolu (həm milli, həm də dünya ədəbi təcrübəsində) haqqında aydın təsəvvürə malik olmalı, çağdaş ədəbi prosesi bütün istiqamətlərdə izləməyi bacarmalıdır"* (Cavadov, 2008, s. 546).

Azərbaycan nəsrində psixologizmin mühüm göstəricisi onun sosial reallıqla əlaqəli olmasıdır. Bədii əsərlərdəki xarakterlər çox zaman şəxsi və ictimai maraqlar arasındakı ziddiyyətlərin formalaşdırdığı mənəvi ayrı-seçkiliklərlə, daxili münaqişələrlə qarşı-qarşıya dayanır.

**Nəticə**

1960–1980-ci illərdə baş verən siyasi-ideoloji dəyişmələr fonunda Azərbaycan yazıçılarının yaradıcılığında insan ruhunun psixoloji analizi yeni məna kəsb edir. Bu, zamanın yeni çağırışlarına cavab, tarixi dəyişikliklər kontekstində mənəvi tarazlıq axtarışlarının bədii ifadəsidir. Müqayisəli aspektdən nəzər yetirdikdə, Azərbaycan nəsrindəki psixologizmin özünəməxsusluğunu daha dərindən izləmək üçün digər milli və dünya ədəbiyyatları ilə, məsələn, rus və ya Avropa ədəbiyyatı ilə müqayisə etmək zəruridir. Müxtəlif dövrlər rus ədəbiyyatında Lev Tolstoy, Fyodor Dostoyevski, İvan Turgenev kimi yazıçılar psixoloji motivləri əhatəli şəkildə ifadə edirdilər. G. Həsənovanın tədqiqatlarına görə: *"Azərbaycan yazıçılarının yaradıcılıq prinsiplərini səciyyələndirməkdə milli sənət təcrübəsinin başqa xalqların sənət təcrübəsi ilə əlaqəsini müşahidə etmək olar. Rus və Azərbaycan yazıçılarının əsərlərində süjet və personajların oxşarlığı sadəcə olaraq bir milli ədəbiyyatın digərinə "təsirinin" nəticəsi deyildir. Bu yaradıcı mənimsəmə prosesi nəticəsində yeni janrlar (milli roman, povest, hekayə) formalaşdı"* (Həsənova, 2022, s. 5).

Azərbaycan ədəbiyyatının müxtəlif ədəbiyyatlarla müqayisəsi insanın mənəvi aləminin təsvirinə yanaşmalarda oxşar və fərqli xüsusiyyətləri açıqlamağa imkan

verir. Məsələn, rus ədəbiyyatında sosial yanaşmalar, mənəvi axtarışlar tez-tez ön planda olarkən bu dövrün Azərbaycan nəsrində psixologizm çox vaxt milli özünüdərk və mədəni ənənələrlə bağlı idi. N. Qənbərovanın bu fikri ilə tam razılaşırıq: *"Milli ədəbiyyatın məziyyətlərini dərk etmək, onun keyfiyyət xüsusiyyətlərini müəyyən etmək onu istər tarixi inkişafında, istərsə də müasir mərhələdə xarici ədəbiyyatla əlaqəsi kontekstində nəzərdən keçirməyə imkan verir"* (Ganbarova, 2023).

1960–1980-ci illər Azərbaycan nəsrində psixologizm insanın mənəvi aləmini, psixoloji münaqişələrini, daxili mübarizəsini araşdırmaq baxımından mühüm rol oynayır. Bu istiqamət digər milli və dünya ədəbiyyatları ilə müqayisəli məzmunda aydınlaşır və bu dövrün Azərbaycan ədəbiyyatı, müəyyən fərqli xüsusiyyətlərə baxmayaraq, insanın sosial-psixoloji həyatında baş verən mühüm dəyişiklikləri ifadə edərək qlobal ədəbi proseslərə fəal formada tabe olur. Şəxsi və ictimai həyatın qarşılıqlı əlaqəsi, eləcə də xarakterlərin psixoloji aləminin dərinliklərinə nüfuzetmə cəhdi mühüm istiqamətə çevrilir ki, bu da 1960–1980-ci illər Azərbaycan nəsrində insan ruhunun bədii dərkinin ifadəsini göstərir.

**Ədəbiyyat**


1. Abbasova, X. (2019). Şərq və Azərbaycan bədii fikrinin Avropa ədəbiyyatına qarşılıqlı təsirinə dair. *Müqayisəli ədəbiyyatşünaslıq*, 202(2), 23–27.
2. AMEA. (2019). *Ədəbi proses*. Hədəf.
3. Cavadov, T. (2008). *Ən yeni Azərbaycan ədəbiyyatı məsələləri*. Monoqrafiya və ədəbi tənqidi məqalələr. BDU.
4. Həsənova, G. (2022). *Lev Tolstoy yaradıcılığının Azərbaycan ədəbiyyatında resepsiyası*. Avtoreferat.
5. İmanov, M. (2021). *Müasir Azərbaycan nəsrində psixologizm*.
6. Paşayeva, N. (2003). *İnsan bədii tədqiq obyekti kimi*. Yeni nəşrlər evi.
7. Sultanlı, V. (2019). *Azərbaycan ədəbi tənqidi*. Nurlar.
8. Ganbarova, N. (2023). *Azerbaydzhansko-russkiye literaturnyye svyazi: k postanovke voprosa.* Na-journal.ru. https://na-journal.ru/10-2023-filologiya-lingvistika/6462-azerbaidzhansko-russkie-literaturnye-svyazi-k-postanovke

9. *Chto takoye psikhologizm*. Skysmart.ru. https://skysmart.ru/articles/literature/chto-takoe-psihologizm
10. Literaturnyye svyazi i vliyaniya — chto eto, vidy, rol', izucheniye. (2015). *Nauchno populyarnyy zhurnal Rukopis.* Litpr.ru. https://litpr.ru/literaturnye-svyazi-i-vliyaniya/

*Azərbaycan dili və ədəbiyyat tədrisi*
2025 / Cild 71, Say 2 / 124–134
https://doi.org/10.48445/t7813-3930-4561-y

# Azərbaycan dilinin "İnsanın emosional vəziyyəti" frazeosemantik sahəsində "Qəzəb"

***Ülkər Xəlilli*** [1]

**XÜLASƏ**
*Məqalədə "qəzəb" anlayışı sahə nəzəriyyəsi prinsipi əsasında araşdırılmış, "insanın emosional vəziyyəti: mənfi emosional hallar" frazeosemantik sahəsinin tərkib hissəsi kimi nəzərdən keçirilmişdir. Sahənin strukturu təhlil olunmuş, nüvə və periferiya zonaları müəyyənləşdirilmiş, hər bir zonanı yaradan vahidlərin əsas xüsusiyyətləri dəqiqləşdirilmişdir. Nüvə zonası üçün daha çox invariant birləşmələr xarakterikdir. Perifeya sahəsində yer alan vahidlər isə öz diferensial xüsusiyyətləri ilə fərqlənir. Məqalədə həmçinin "Qəzəb" altsahəsini təşkil edən frazeoloji vahidlərin əlamətləri tədqiq olunmuş, bu vahidlərin əsas xüsusiyyətləri və təzahür şəkilləri araşdırılmışdır. İnsan qəzəblənərkən orqanizmində müxtəlif dəyişikliklər baş verir və bu dəyişikliklər frazeoloji vahidlərin semantikasında da özünü göstərir. Məqalədə "qəzəb" anlayışını ifadə edən sabit söz birləşmələrinin semantik xüsusiyyətləri ilə bağlı məsələlər də yer alır. Dilimizdə frazeoloji vahidlərdəki variantlılıq da maraq doğurur. "Qəzəb" sahəsində variant yaratma yolları nəzərdən keçirilmiş, eyni vahidin müxtəlif variantları və onların yaranma üsulları tədqiqata cəlb olunmuşdur.*

**AÇAR SÖZLƏR**
*frazeosemantik sahə, emosional vəziyyət, nüvə, periferiya, variantlılıq*

**MƏQALƏ TARİXÇƏSİ**
Göndərilib: 09.03.2025
Qəbul edilib: 08.05.2025

---

[1] Doktorant, AMEA Nəsimi adına Dilçilik İnstitutu. Azərbaycan.
https://orcid.org/0009-0003-0335-4904 | ulkerxelilli@gmail.com

 

*Teaching of Azerbaijani Language and Literature*
2025 / Volume 71, Issue 2 / 124–134
https://doi.org/10.48445/t7813-3930-4561-y

# "Anger" in the Phraseosemantic Field of "Human's Emotional State" of the Azerbaijani Language

***Ulkar Khalilli*** [1]

**ABSTRACT**

*In the article, the concept of "anger" was investigated according to the principle of field theory, and it was considered as a part of the phraseosemantic field "Human emotional state: Negative emotional states". The structure of the field was analyzed, core and peripheral zones were defined. The main characteristics of the units that make up each zone are specified. If the core zone is characterized by more invariant units, the units located in the periphery area differ in their differential properties. Also, signs of phraseological units that make up the "Anger" subfield were studied, the main characteristics and manifestations of these units were examined. When a person is angry, various changes occur in his body, and these changes are also reflected in the semantics of phraseological units. The article also includes issues related to the semantic characteristics of fixed word combinations expressing the concept of anger. Variation in phraseological units in our language is also interesting. Ways of creating variants in the field of "Anger" were studied, different variants of the same unit and their methods of creation were involved in the study.*

**KEYWORDS**

*phraseosemantic field, emotional state, core, periphery, variants*

**ARTICLE HISTORY**

Received: 09.03.2025
Accepted: 08.05.2025

---

[1] PhD student, Institute of Linguistics named after Nasimi of ANAS. Azerbaijan.
https://orcid.org/0009-0003-0335-4904 | ulkerxelilli@gmail.com

 

## Giriş

Sahə nəzəriyyəsinin frazeologiyaya tətbiqi frazeosemantik sahələrin yaranması ilə nəticələnir. Bu sahələr frazeologiyanı sistemli şəkildə tədqiq etməyə imkan verir.

Frazeosemantik sahələr içində "İnsanın emosional vəziyyəti"nin özünəməxsus yeri var. Ümumiyyətlə, psixologiyanın tədqiqat obyekti olan insanın emosional vəziyyəti antroposentrik prizmadan yanaşdıqda linqvistika üçün də böyük əhəmiyyət kəsb edir. Hiss və emosiya insanın dərk etdiyi cisim və hadisələrə, digər şəxslərə, həmçinin öz rəftar və davranışına, fikir və arzusuna bəslədiyi münasibəti ifadə edən psixi prosesdir (Bayramov, Əlizadə, 2006, s. 153). Bu proses həmçinin nitqdə frazeoloji vahidlər vasitəsilə öz əksini tapa bilir.

Frazeologiyada mühüm yer tutan emotivlər arasında "Qəzəb" altsahəsini xarakterizə edən frazeoloji vahidlər xüsusilə fərqlənir. Belə ki, frazeoloji söz birləşmələri ekspressiv xüsusiyyət daşıyır və onların emosiyaların dildə ifadəsində əhəmiyyətli rolu var. Bu, ilk növbədə, insanın emosional vəziyyətini ifadə edən frazeoloji vahidlərin ekstralinqvistik təbiəti ilə bağlıdır.

## Metodlar

Araşdırma Azərbaycan dilinin materialları əsasında aparılmışdır. Tədqiqat zamanı əsas mənbə kimi "Azərbaycan dilinin frazeologiya lüğəti"ndən istifadə olunmuşdur. Lüğətdə yer alan frazeoloji vahidlər təhlil olunmuş, tərkibi və strukturu müəyyənləşdirilmiş, semantikası əsas götürülərək qruplaşdırılmışdır. Həmçinin frazeoloji vahidlərin müxtəlif variantları müqayisə edilmiş, Azərbaycan dilinin frazeologiyasında variant yaratma yolları tədqiqata cəlb edilmişdir.

## Nəticələr

Frazeoloji vahidlərin dildə hazır şəkildə mövcud olması və bölünməzliyi onların ümumi məna ətrafında birləşməsinə və sahə yaratmasına səbəb olur. "Sabit söz birləşmələrində sözlərin sərbəstliyinə yol verilmir. Belə birləşmələr tarixən yaranır və onlardakı sözlər daşlaşmış vəziyyətdə olur: bu birləşmələri hissələrinə ayırmaq və sintaktik baxımdan qrammatik təhlilə cəlb etmək olmaz" (Rəcəbli, 2021, s. 6).

Ümumiyyətlə, semantik məna frazeoloji vahidlərin əsas xüsusiyyətlərindən biridir. "Frazeoloji vahidlərdə məzmun planı ilə ifadə planı üst-üstə düşmür və bu zaman semantik tranformasiya baş verir. Bu çevrilmə nəticəsində sərbəst söz birləş-

